DOI: https://doi.org/10.36719/2706-6185/15/5-8

**Səidə Cəfər qızı İsmayılzadə**
Gəncə Dövlət Universiteti
tarix üzrə fəlsəfə doktoru
saida.ismailzade @mail.ru

# AVROPANI QARANLIQ ÇAĞLARDAN İNTİBAH DÖVRÜNƏ ÇIXARAN ƏNDƏLÜS MƏDƏNİYYƏTİNƏ DAİR

**Xülasə**

Əndəlüs 711-1492 ci illər arası müsəlmanların Priney yarımadasında hakim olduqları ərazilərə verilən addır. Əndəlüsdə dövlət yarandıqdan sonra müxtəlif elm sahələri sürətlə inkişaf etdi. Fəlsəfə, tibb, riyaziyyat, astranomiya sahələrinə aid fundamental əsərlər yazıldı. Avropalılar antik müəlliflərin əsərləriylə yenidən Əndəlüs vasitəsiylə tanış oldular. Əndəlüs 8 əsr İslam mədəniyyətinin Avropadakı mərkəzi oldu. Avropa İslam mədəniyyəti sayəsində inkişaf edən tibb, elm, təhsil və memarlıqdan artıqlaması ilə istifadə etdi. Bir çox tarixçi Avropa İntibahının başlanğıc nöqtəsinin Əndəlüs mədəniyyəti olduğunu düşünür və Kordovanı “ən yüksək mədəniyyət səviyyəsinə malik şəhər” kimi göstərir.

***Açar sözlər:*** *Əndəlüs, İslam mədəniyyəti, Avropa intibahı, Kordova, fəlsəfə, tibb*

**Saida Jafar Ismayilzade**
Ganja State University
Ph.D in history
saida.ismailzade @mail.ru

## About Andalusian culture, which brought Europe from the dark ages to the Renaissance

**Abstract**

Andalusia is the name given to the Muslim-influenced regions of the Iberian Peninsula between 711 and 1492. After the formation of the state in Andalusia, various fields of science developed rapidly. Fundamental works were written relating to the fields of philosophy, medicine, mathematics and astronomy. Europeans again became acquainted with the works of ancient authors through Andalusia. Andalusia became the center of Islamic culture in Europe in the 8th century. Europe made the most of the medicine, science, education and architecture that developed thanks to Islamic culture. Many historians consider the Andalusian culture to be the starting point of the European Renaissance and point to Córdoba as "the city with the highest level of culture".

***Keywords***: *Andalusia, Culture of İslam, European renaissance, Cordoba, philpsophy, medicine*

## Giriş

Əndəlüsdə üç mərhələli təhsil sistemi mövcud olmuşdur. Uşaqların ilk təhsili altı yaşlarından başlayıb yeddi-səkkiz il davam edirdi. Təhsilin ilk mərhələsində şagirdlərə quran, islam şəriəti, ərəb dili və şeir öyrədilirdi. İbtidai təhsil adətən dövlət tərəfindən tikilən yataqxanası olan məktəblərdə tədris edilirdi. Kiçik məscidlərdəndə məktəb kimi istifadə edilirdi. Müəllim və Müdərislər dövlətdən maaş alırdılar. İmkanlı şəxslərin maliyyələşdirdiyi özəl məktəblərdə mövcud olmuşdur. İbtidai təhsillərini başa vuran şagirdlər istədikləri təqdirdə təhsillərini davam etdirə bilirdilər (Adullah, 1955: 13). Təhsilin ikinci mərhələsi “şüyuh” adlanan müdərrislərin təşkil etdiyi mədrəsələrdə davam etdirilirdi. Həmin mədrəsələrdə dil və ədəbiyyat, hüquq, tibb, məntiq, kimya, riyaziyyat kimi elmlər tədris edilirdi. İxtisaslaşmış müəllimlərdən dərs alan tələbələr təhsillərini başa vurduqdan sonra şəhadətnamələr alırdılar. Şüyuhların maaşı da dövlət tərəfindən və ya vəqf mülklərinin gəlirindən təmin olunurdu. Təhsilin üçüncü mərhələsi Kordova Granada həmçinin Qahirə və Şam kimi elm mərkəzlərinin ali məktəblərində davam etdirilirdi. Hökümdar, Hacib (hacib Əndəlüsdə baş vəzirini vəya baş nazirin vəzifələrini icra edən ali rütbəli məmur) vali kimi dövlət adamları özəl müdərrislər tutaraq sarayların

nəznində və ya öz evlərində mədrəsələr təşkil edir övladlarının daha keyfiyyətli təhsil almalarına çalışırdılar. Əndəlüs erkən orta əsrlər dövrünün elm mərkəzi idi. Erkən orta əsrlərdə Qərbi Avropanın hakim sülalə nümayəndələri və iri feodalları övladlarının Əndəlüs ali məktəblərində təhsil almalarına çalışırdılar (Abdullah, 1955: 214).

Priney yarmadasının müsəlmanlar tərəfindən fəthindən sonra Prineyin yerli xalqları latın dilinin müxtəlif ləhcələrində bərbərilər və sayları olduqca az olan ərəblər isə öz ana dillərində danışırdılar. Ancaq Şimali Afrikadan əndəlüsə yeni ərəb köçləri həmçinin yerli qadınlarla evlilik ərəbcə danışanların sayının sürətlə artmasına səbəb oldu. Müvəlidlər ana dilləri olan latıncadan başqa ərəb dilində öyrənir hər iki dildə mükəmməl danışırdılar. Bərbərilər tədricən öz dillərini unudaraq ancaq ərəbcə danışmağa başladılar. Ərəb dilinin möhkəmlənməsinin və inkişafının əsas səbəbləri dövlətin rəsmi dilinin həmçinin məktəblərdə tədrisin ərəbcə olması idi. IX əsrin ortalarından ərəbcə bütün müsəlmanların və qeyri müsəlmanların ümumi ünsiyyət və yazı dilinə çevrildi (Abdullah, 1955: 15). Dövrünün tarxi qeydlərinə görə xristiyan gənclər latınca düzgün adlarını yaza bilmədikləri halda ərəbcə fəlsəfi əsərlər oxuyur şeirlər yazırdılar. Ərəbcənin yayılmasıyla paralel dilçilik elmidə inkişaf edirdi. Əvvəllər Yerli filoloqlar məktəblərdə şərqdə yazılan kitablardan tədris edirdilər. Əndəlüs dilçi alimlərindən Gazi bin Kays, Abdulməlik bin Habib, Qasım bin Sabit və digərləri yazdıqları əsərlərdə metod və içərik olaraq şərqdə yazılan qrammatika kitablarını örnək almışlar. Sonrakı nəsillər xüsusən X əsrdən başlayaraq Sibeveyhin əl Kitab, Asmainin əl Əmşal, İbnül Kuteybənin Ədəbul kitab, Mübərrədin əl Kamil kimi əsərləri şərh hətta tənqid və düzəliş edə biləcək səviyyəyə çatdılar. Digər tərəfdən Əbu Ali əl Kali, İbnul Kuteyyə, Əbubəkr əz Zubeyid kimi dilçi alimlər metod və yazılış cəhətdən orjinal əsərlər qələmə aldılar.

İbni Malik ərəb dilinin qrammatikasını nəzm şəklində min beytlik Əl Əlifiyə kitabında yazdı. Sonrakı əsrlərdədə əndəlüsdə dilçilik dahada inkişaf etdirildi ərəb dilinin qrammatikasına dair sanballı əsərlər yazıldı (Leiden, 1981: 3).

IX əsrin ortalarından Əndəlüsdə fəlsəfə inkişaf etməyə başladı. Erkən Əndəlüs filosoflarından İbn Məsərrə batinilik və antik Yunan filosofu Empedolesin təsiri altında əsərlər yazmışdır. XII əsrdə yaşamış eyni zamanda sufi olan böyük filosof İbnul Arif Əndəlüs fəlsəfəsini sistemləşdirdi. İbn Hazm əl Faşl əsərində islam əqidəsinə müxalif fəlsəfi görüşləri tənqid etmişdir. İbn Hazmın müasiri yəhudi əsilli Əndəlüs filosofu əl Cebriol (de Gabrirl) Yənbul Hayat kitabını yazmışdır XII əsr Əndəlüs fəlsəfəsinin ən parlaq dövrü sayılır (Abdullah, 1955: 115). Aristotelin əsərlərin şərhinə dair bir çox kitab və risalə yazan böyük filosof İbn Baccə klassik kəlamla fəlsəfəni ayırmağa çalışmışdır. İbn Tufeyl Əsrarul Hikmətil Məşriqqiyyə əsərini qələmə aldı. Məşai fəlsəfə məktəbinin son böyük nümayəndəsi Aristotelin əsərlərinə ən sanballı şərhlər yazan İbn Rüşd imam Gazaliyə cavab məqsədiylə "Tehafətu Tehaftil felasifə" əsərində fəlsəfəni kəlama qarşı müdafiə edir. İbn Rüşd Faşlul Makal və Əl Kəfan Menahicil Ədillə adlı əsərlərində fəlsəfəylə dinin qayələrinin eyni, metodlarının fərqli olduğunu irəli sürür. İbn Rüştün təsirində qalan yəhudi əsilli Əndəlüs filosofu Musa bin Meymun Yəhudilik çərçivəsində fəlsəfi əsərlər yazdı. Əndəlüsdə məntiq elmidə inkişaf etmişdi. İbn Hazm Ət Takrib li haddil mantık İbn Tulmus Kitabul mədxal li şinatul mantıq əsərləriylə Əmdəlüsdən kənardada tanınırdılar (TDV, 1995: 216).

Əndəlüsdə tarix elminədə maraq böyük olmuşdur. Üslub olaraq şərq tarix məktəbi örnək götrülərək Əndəlüs mərkəzli ümumi və xüsusi müxtəlif mövzularda tarixi əsərlər yazıldı. Ədəbiyyat tarixləri yazılaraq külli miqdarda qaynaqlar formalaşdı. İlk tarixi əsərlər əmrliklər dövründə yazılmağa başladı xilafət və mülküt tavaif dönəmlərində dahada inkişaf etdi (Ẕikru bilâdi'l-Endelüs, 1983). Görkəmli tarixçilərdən Abdülməlik bin Habib ət Tarix, Ahməd ər Razi Axbarul mulkil Əndəlüs, İbnül Küteyyə Tarixu iftitahil Əndəlüs, İbnül Heyyan əl Müktəbəs, İbn Hazm Cemheratu Ənsabil Arab, İbnül Xatib əl İhata və Amalul Alam, İbnul Fəradi Tarixu ülemail Əndəlüs kimi tarixi əsərləri yazdılar. Ədəbiyyat tarixinə İbn Bəssamın ez Zahirə, İbn Haqanın Kalaid dül İkyan əsərlərini göstərmək olar. Əndəlüsdə coğrafiya elminə aid dəyərli əsərlər yazılmışdı. Həmən kitablardan Uzrinin Tərşiul Axbar, Əbu ubəyd əl Bəkrin əl Məsalik vəl Məmalik və Mucəmu Məstəcəm, Himyerin ər Ravzul Mitar kitablarını göstərmək olar. Həmçinin İdrisi, Əbu Hamid əl Granadi, İbn Cübeyr kimi coğrafiyaçı səyyahlar coğrafiya elminə əvəzsiz töhvələr vermişlər (Yazar, 2005: 9).

822 ci ildə məhşur musqiçi alim Ziryabi Kordovaya gəldi. Ziryabinin səyləri sayəsində Kordovada Valensiya və Teldo kimi şəhərlərdə musiqi elmini tədris edən məktəblər konservatoryalar açıldı. XII

əsrdə Əndəlüs musiqi məktəbi dünyanın ən inkişaf etmiş məktəbi idi. Əndəlüs musiqisi Qərbi Avropa musiqi sənətinə güclü təsir etmişdi (TDV, 1995: 219).

Priney yarımadasında 781 il hakim olan müsəlmanlar burada möhtəşəm sənət əsərləri yaratmışlar. Əndəlüs sənətkarları yaratdqları əsərlərlə tək islam aləminin yox bütövlükdə dünaya memarlığının və incəsənətinin sonrakı inkişafına böyük təsir etmişlər. Əndəlüs memarlığı ənənəvi şərq memarlığından fərqli özünə məxsusinkişaf yolu keçmişdir. Bu fərqliliyin əsas səbəblərindən biri Əndəlüsün Orta Şərqin mədəniyyət mərkəzlərindən uzaqda, iki fərqli sivilizasiyanın qovşağında yerləşməsindən irəli gəlirdi. Əməvilər dövrü Əndəlüs memarlığının şah əsəri Kardova cümə məscidini (əl məscidil Kəbir) göstərmək olar. Hal hazırda Kordovada kilsə kimi istifadə olunan məscid Əndəlüs memarlığının ən məhşur və ən böyük binasıdır. Kordova mərkəz camisi Samirə cümə məscidi və Əbu Düləf məscidlərindən sonra dünyada üçüncü ən böyük məscid olmuşdur. Digər bir əzəmətli tarixi əsər Teldo cümə məscidir. 1000-ci ilin əvvəllərində tikildiyi düşünülən məscid arxitekturası və naxışlarıyla (TDV, 1995: 222) ziyarətçilərini heyran edir. Əndəlüs hökümdar saraylarına nümunə olaraq Qranada şəhərində yerləşən əl Hamra sarayını göstərmək olar. Qızıl qəsr mənasına gələn əl Hamra sarayı əndəlüs memar xəttat və rəngsazlarının yüksək peşəkarlığına həmin binaları tikdirən dövlət adamlarının isə zərif zövqünə bariz nümumədir.

Əndəlüslü astranomlar yerin radiusunu yunanlardan daha dəqiq hesabladılar. Astronomiya ilə birlikdə riyaziyyat elmidə inkişaf edirdi. Astronomiya və riyaziyyat sahəsində böyük alimlər yetişirdi. Bu alimlərdən Əbu Bəkir əl Ənsari əmr Hakimin təsis etdiyi Kordova mədrəsəsində astronomiya və riyaziyyat elmlərini tədris etmişdi. Əndəlüsün Evklidi sayılan Əbül Qasim əl Məcriti fundamental Risalətül Usturula əsərini yazdı həmçinin Xarəziminin Ziccinində düzəlişlər etdi. Onun tələbəsi İbn Xaldun aritmetika, ərazilərin dəqiq ölçülməsi və vergi hesablamalarına aid əsərlər yazdı. Zərkali dövrünün ən mükəmməl astronomiya sahəsinə aid alətlər hazırladı. 12-ci əsrdə yaşamış Cabir bin eflah və Əbu İshak Kitabul Həyə adlı əsərləriylə astronomiyanın inkişafına əvəzsiz töhvə verdilər (Abdülmelik, 1965: 41-126).

İlk dəfə bitki və heyvan nümunələrini araşdırmaq və toplamaq məqsədiylə şərqə tədqiqatçı XI əsrdə Əndəlüsdə bu günkü tədqiqat-istehsal mərkəzlərinə bənzər botanik bağlar salınırdı. Əndəlüslü botaniklər torpağın aqrotexniki qaydada əkilməsi gübrələnməsi və sulanmasına həmçinin calaq və zərərvericilərə qarşı mübarizəyə aid dəyərli kitablar yazmışlar. İbn Vafid İbn Həccac İbnul Baytar kimi alimlər bağçılıq sahəsində araşdırma aparmış həmin mövzuda çoxlu kitablar yazmışlar (Yazar, 2005: 6).

Əndəlüslü müsəlmanlar tibb sahəsindədə uğurlar qazandılar. Müsəlman şərqindən öyrəndikləri tibb elminidə dahada inkişaf etdirdilər. Xüsusən heyvanlar üzərində apardıqları tədqiqat sayəsində fizyalogiyada önəmli uğurlar qazandılar. Fizyalogiya və anatomiya sahələrində Galen və Hipakrat kimi klassik dövr həkimlərinin kitablarından istifadə edərək onların bir çox səhflərini düzəltdilər. Öyrəndikləri elimləri praktikada tədbiq etdilər. Bir çox cərrahi alətlər hazırlayaraq köhnə alətləri təkmiləşdirdilər (TDV, 1995: 219). Əndəlüs həkimləri bir çox ağır cərrahi əməliyyatlar keçirirdilər. Onlar gözdən mirvari suyunu açıq əməliyyat vasitəsiylə kənarlaşdıra bilirdilər. Dərman bitkilərinin tədqiqi sayəsində farmakalogiya inkişaf etdi. Əczaçılığa dair çoxlu əsərlər yazıldı. Tibb və kimya sahəsində mütəxəssis olan Qasım əz Zəhravi otuz ciltlik at Taşrif adlı tibb ensiklopediyasını yazdı. Filosof İbn Rüşt həmçinin tanınmış həkim idi o tibb sahəsinə aid on altı əsər yazmışdı. İbnül Baytar müxtəlif yemək və dərman növlərinin hazırlanması və tədbiqinə dair Əl Camili Müfrədatil ədviyyə və Ağziyə əsərini yazmışdır. Həmin əsər uzun müddət (Yazar, 2005: 7) Avropa və Şərq həkimlərinin müraciət etdikləri kitab olmuşdur. Əndəlüsdə çoxlu tibb ocaqları mövcud olmuşdur. Təkcə Kordova şəhərində 60-dan çox xəstəxana var idi (Abdullah, 1955: 13).

**Nəticə**

Əndəlüs 711-ci ildən etibarən müxtəlif dinlərə və etnik qruplara məxsus xalqların birlikdə formalaşdırdığı mükəmməl və işıqlı bir mədəniyyətin doğuşuna ev sahibliyi edirdi. Həmin dövürlərdə kilsə bütün əqli fəaliyyətləri qadağan etdiyindən bütün Qərbi Avropa "qaranlıq əsrlər" adlanan tarixi dövrü yaşayırdı (Vallve, 1970: 17-33).

XI əsrdən Avropalıların Əndəlüs və Suriya torpaqlarına etdikləri xaçlı yürüşləri sayəsində islam mədəniyyəti ilə tanış oldular. Avropalılar ərəb dilində yazılan kitabların tərcüməsinə girişdilər. Minlərlə

elmi əsər ərəb dilindən latın dilinə tərcümə edildi. Avropalılar ərəb rəqəmləriylə onluq say sistemi, cəbr, həndəsə, tibb, kimya kimi elm sahələriylə məhz Əndəlüs vasitəsiylə tanış olmuşlar. Bir çox Avropa şəhərində Əndəlüs və digər Şərq ölkələrində olduğu kimi kitabxanalar açıldı. Əndəlüs mədrəsələri model götürülərək yeni ali məktəblər unveristetlər təsis olundu. Avropada yaşanan mədəni partlayış kilsənin hakimiyyətini sarsdı nəticədə qərbdə yeni dövr Rönesans və ya intibah mədəniyyəti dövrü başladı (Monroe, 1970).

## Ədəbiyyat


1. Abdullah, T. (1955). Kahire: E.Levi-Provencal.
2. Leiden. (1981). Muslim Spain. s.711-1492.
3. TDV. (1995). İslam Ensiklopediyası. İstanbul, s.211-225.
4. Zikru biladi'l-Endelus (1983). Madrid.
5. Yazar, Y. (2005). Əndəlüs siyasi tarixi. Ankara.
6. Əbdülməlik, K. (1965). Kitabu'l-İktifa fiəhbari'l. Madrid: AM. əl-Abbadi, Madriddəki Misir İslam Araşdırmaları İnstitutunun jurnalı, s.41-126.
7. Vallve, J. (1970). La Division territorial de la Espana musulmana. Madrid, s.17-33.
8. Monroe, J. (1970). The Shubiyya in al-Andalus. Berkeley-Los Angeles.
9. Leiden. (1970). Islam and the Arabs in Spanish Scholarship.
10. A Curious Morisco Appeal to the Ottoman Empire. (1966). Madrid: Al-Andalus, s.116-173.


Göndərildi: 25.06.2022 Qəbul edildi: 03.09.2022

DOI: https://doi.org/10.36719/2706-6185/15/9-12

**Vasif Balakhan Haziyev**
Azerbaijan Cooperation University
1_hvb_1@mail.ru

# SUSTAINABLE DEVELOPMENT OF THE NATIONAL FOOD MARKET IN AZERBAIJAN

**Abstract**

A system of indicators for achieving sustainable development and determining food security in the agricultural sector, which is the basis of the food complex in our republic, has been defined. In the current conditions, the assessment of food security as a global and development problem is taken as a basis. Here, practical measures have been taken in this field, considering the quality and ecological purity of food products as important criteria. In order to achieve the sustainable development of the national food complex in our republic, a system of indicators determining food safety has been defined and its economic evaluation has been carried out. In the context of globalization, grain and its processed products form the basis of food supply in the variants of indicators of the population's food resource potential. One of the conceptual issues of modern economic development is the determination of optimal ratios between self-sufficiency and globalized food sectors at the level of national food economic policy. Supplying the population with food products is not only the main condition of economic development and macroeconomic stability, but also an integral part of state independence. Maintaining a dynamic balance between demand and supply in the market is functionally dependent on the state's ability to increase its food resources.

***Keywords:*** *sustainable development, research, mass production, social manifestations, trade*

**Vasif Balaxan oğlu Həziyev**
Azərbaycan Kooperasiya Universiteti
1_hvb_1@mail.ru

## Azərbaycanda milli ərzaq malları bazarının davamlı inkişafı

**Xülasə**

Respublikamızda ərzaq kompleksinin əsasını təşkil edən aqrar sahəyə dair davamlı inkişafa nail olmaq və ərzaq təhlükəsizliyini müəyyən edən göstəricilər sistemi müəyyənləşdirilmişdir. Mövcud şəraitdə ərzaq təhlükəsizliyinin qlobal və inkişaf problemi kimi dəyərləndirilməsi əsas götürülmüşdür. Burada ərzaq məhsullarının keyfiyyəti və ekoloji cəhətdən təmizliyi vacib kriteriya kimi fikir veriləcək bu sahədə əməli tədbirlər həyata keçirilmişdir. Respublikamızda milli ərzaq kompleksinin dayanıqlı inkişafına nail olmaq üçün ərzaq təhlükəsizliyini müəyyən edən göstəricilər sistemi müəyyənləşdirilmiş və onun iqtisadi qiymətləndirilməsi aparılmışdır. Qloballaşma şəraitində əhalinin qida rasionunun potensialının göstəricilərinin variantlarında taxıl və onun emal məhsulları ərzaq təminatının əsasını təşkil edir. Müasir iqtisadi inkişafın konseptual məsələlərindən biri milli ərzaq iqtisadi siyasəti səviyyəsində özünü təmin etmək və qloballaşan ərzaq sahələri arasında optimal nisbətlərin müəyyən edilməsidir. Əhalinin ərzaq malları ilə təchizi nəinki iqtisadi inkişafın və makroiqtisadi sabitliyin əsas şərtidir, həm də dövlət müstəqilliyinin ayrılmaz tərkib hissəsidir. Bazarda tələblə təklif arasında dinamik tarazlığın saxlanılması dövlətin ərzaq resurslarının artmasına nail ola bilməsindən? funksional asılılıqdadır.

***Açar sözlər:*** *dayanıqlı inkişaf, araşdırmalar, istehsalın kütləvi xarakteri, sosial təzahür, əmtəə tədavülü*

## Introduction

Market relations played a big role in the process of economic and social development of mankind. Although it appeared much later than the first stages of the development of human society, it was of particular importance in the dynamic growth of economic processes. Separate periods of the history of the evolution of the market were formed according to the stages of economic development of humanity

and reflected it's certain characteristics. The period of economic development can be divided into two stages that differ from each other in important qualitative aspects; the period before commodity production and the period of commodity production.

It is known that the market emerged as a result of the social division of labor in the pre-capitalist social-economic formations. However, the characteristic feature of that period was that the relations between economic units were not regular and simply had an episodic character (Buzan, 1991:218).

The gradual deepening of the social division of labor and the trend of economic separation of consumers brought commodity production to the fore at the global level, which led to the formation of real market relations and the formation of a free competitive market.

The widespread application of the achievements of the scientific and technical revolution in the economy, the aggravation of the problem of new goods and the problem of sales, significantly increased the role of information in the interaction between market subjects, and ensured qualitative changes in the economic nature of the market. As a result, a "buyer's market" was formed (Kearney, 2003:439).

Until the modern era, a large number of scientific-research works have been dedicated to the investigation of the content, essence and development laws of the market concept. However, the market concept is explained from different perspectives. The food complex is an integral part of the strategy of sustainable development of the food economy system, which is required by the national economic development and in the global context. The food products that ensure the existence of humanity have a global character, and extensive analyzes have been carried out in scientific and practical sources. In solving the problem, agricultural and processed products form the basis of the formation of the food complex. The organization of the food complex and the position of the food market are considered important problems on a global scale, as well as a stable indicator of countries.

The food complex, its management being an important component of global economic development, occupies a special position in the leading directions in the formation of the political lifestyle of each country. The main subject and object of the strategic side of the issue is the management of the population with constructive approaches related to the sustainable operation of the food supply.

In modern times, man is considered to be inexhaustible and constantly improving natural resources. The main indicator of development has always been the human factor. The concept of human capacity development is one of the most well-known intellectual products developed by the United Nations Development Programme. It is based on the "human potential development index". It is calculated for the entire population and characterizes the generally long and healthy life of people in the country, the level of education and decent living standards (Aliyev, 2003:66).

Since food supply is a global problem, it is considered one of the main sections of the political-economic strategy of each country. The national food policy of the country is related to the development of agriculture. This area of the world economy, despite certain directions of economic development, is related to the use of agricultural products as the basis of the lifestyle of the population living in 3/5 of our planet. According to the UN, 41% of the economically active population around the world works in agriculture. This indicator is 4-5% in industrially developed countries. In developing countries, it is 60-70%. The world's largest producers of agricultural products; China (21%), India (15%), USA (7%) etc. countries with large populations differ in this respect. Developed countries provide approximately 48% of the population's food grains (24% in the USA, 16% in the European Union).

Food Security According to the criteria established by the experts of the UN Food and Agriculture Organization, food security means a situation where all people have physical and economic access to sufficient quality food to lead an active and healthy lifestyle. The declaration adopted at the summit organized in Rome in 2008 states that every state has the duty to ensure the right of its citizens to have access to safe food for their health and to be free from hunger (Amstryp, 1996:257).

When characterizing the flow directions of food products at the global level, their content and dynamics, it is necessary to take into account the decisive role of international food companies.

Because, the main part of the processed food, the majority of agricultural products exported to the world market are produced within the framework of international food companies or under their direct technological, financial organizational and other influences. At the global conference dedicated to the

environment and development, the main directions of international environmental security were discussed and became the priority of the national security strategy of many states.

From the point of view of ensuring food security, the state regulation of these relations is primarily characterized by the realization of state support to agricultural commodity producers. This process is more successfully realized in the experience of developed countries. For example, in Germany, Canada and France, the expenses incurred for the production of agricultural products from the state budget vary by approximately 43-54%.In Scandinavian countries, this indicator fluctuates up to -60-80%. In the post-Soviet republics as a whole, the expenditure imposed on the state support of agriculture amounts to about 1.5% of the state budget as a whole. By modernizing the legal-normative base of the agricultural sector, raising the national level of production both qualitatively and quantitatively, the Republic of Azerbaijan can gain the opportunity to fill that gap in the world market (5).

The directions of efficient use of resources have been determined in connection with the sustainable development of the agricultural sector, which is the basis of the food complex in Azerbaijan.

For the first time in our republic, as a result of enumeration of all areas of agriculture, detailed information on land ownership, cultivated areas of agricultural plants, area of perennial crops, agricultural equipment, labor force was collected.

In connection with the sustainable development of the agricultural sector in our republic, increasing the production of plant and livestock products is of great importance in ensuring food security.

In the current State Program, the main directions of the state policy in the field of food supply are divided into 4 groups and the following criteria are implemented for each of them:

1. Criteria for efficient use of resources in the area of sustainable food supply.
2. Criteria for providing the population with safe and quality food products and their efficient use.
3. Criteria for effective management of risks related to food supply
4. Criteria for improving the entrepreneurial environment and institutional development of the food supply system (Guliyev, 2018:480).

In order to achieve the sustainable development of the national food complex against the background of globalization in the State Program, a plan of measures for certain areas at the state and government level was regularly developed and decisions were made.

In recent years, in order to achieve the sustainable development of the national food complex in our republic, a plan of measures for certain areas has been developed and decisions have been made regularly at the state and government level.

A system of indicators for achieving sustainable development and determining food security in the agricultural sector, which is the basis of the food complex in our republic, has been defined. In the current conditions, the assessment of food security as a global and development problem is taken as a basis. Here, practical measures have been taken in this field, considering the quality and ecological purity of food products as important criteria.

In order to achieve the sustainable development of the national food complex in our republic, a system of indicators determining food safety has been defined and its economic evaluation has been carried out.

The availability of food resources in the world and forecasts for the future are analyzed and monitored by international organizations, primarily by the Food and Agriculture Organization (FAO) established under the UN. The food problem is regularly discussed in international forums (Bislev, 2004:72).

It should be noted that food security is an important element of the state's economic security as well as its political and environmental security and has an important role in ensuring national security. In the Republic of Azerbaijan, food safety is considered one of the central problems of the national security system, and special care and attention is paid to this issue at the state level. Taking into account the current situation in the food security problem in our country, the "Food Security Program of the Republic of Azerbaijan" was approved by the order of the great leader Heydar Aliyev in 2001, and as a result of the work undertaken within the framework of this program, the production of agricultural and food products increased significantly. However, the current situation in the world food market requires a comprehensive approach to the issue of maximum reduction of the domestic food market's dependence on imports and creation of food reserves (Sultanov, Ahmadov, 2018:13).

The food problem is not only solved within the framework of agriculture. The share of the agrarian sector in food supply, the technological development level of the country, in turn, has the possibility of having an important influence on the harmony of the agricultural sector. Indicators characterizing the activity of the food market, in particular, indicators such as prices, the value of the consumer basket, farmers' incomes, determine the development strategy of the agrarian sector in one way or another. It is formed depending on the realization of priotets in the period of time.

As a result of the conducted studies, it was determined that the food security of the state is considered to be ensured when there is no food crisis when the entry of food products from abroad into the country stops, and in the total volume of agricultural raw materials and food sold in the market, 9% of locally produced grains, 96% of potatoes, sugar 82, vegetable oil -80, meat meat products, milk and dairy products -86-90, fish and fish products -80% if not less.In order to meet the general demand for food products through local production, taking into account these parameters, the volume of agricultural products to be produced is determined on the basis of the population and per capita norms of basic food products. In order to fully satisfy the demand for seeds, the State Seed Fund was established under the Ministry of Agriculture by the order of the President of the Republic of Azerbaijan dated March 2, 2015. At the same time, by the decision of the Cabinet of Ministers dated December 8, 2015, "Rules for the supply, storage and use of seeds to the State Seed Fund" were approved (Lanov, 2006:39). According to statistical indicators, currently Azerbaijan meets its demand in plant breeding and poultry industry at the level of about 20 percent.

## Conclusion

In the context of globalization, grain and its processed products form the basis of food supply in the variants of indicators of the population's food resource potential. One of the conceptual issues of modern economic development is the determination of optimal ratios between self-sufficiency and globalized food sectors at the level of national food economic policy. Along with common human values, the globalized food policy ensures the stability of the continuous food ration of the population, and performs the function of balancing the production of food products with new technology.

According to the criteria established by the experts of the UN Food and Agriculture Organization (FAO), food security means a situation where all people have physical and economic access to sufficient quality food to lead an active and healthy lifestyle at any time.

## References

1. Buzan, B. (1991). People, states and fear: an agenda for internationalsecurity studiesin the postcold war era, New York, Harvester Wheatsheaf, 218 p.
2. Kearney, A. (2003). Measuring globalization. International politics-enduring consepts and conternporary issues, Longman publishers, 439 p.
3. Aliyev, R. (2003). Agrarian market and food safety issues. Baku, 102 p.
4. Amstryp, N. (1996). The percnial problem ofsmallstates: a survery of research efforts, Cooperation and conflict. London, Oxford, 257 p.
5. http://unec.edu.az/application/uploads/2015/12/mirzaliyeva_günel.pdf
6. Guliyev, E. (2018). "Global food security: realities and prospects". Baku, "Cooperation" publishing house. 480 p.
7. Bislev, S. (2004). Globalization, state transformation and public security. International politicalscience review, Vol. 25. 587 p.
8. Sultanov, R., Ahmadov, E. (2018). Food security and sustainable development. Program Baku, 13 p.
9. Lanov, E. (2006). New world order and national development. Baku, 295 p.

Received: 24.07.2022 Accepted: 17.09.2022

DOI: https://doi.org/10.36719/2706-6185/15/13-17

**İlkanə Rabil qızı Əmirova**
Bakı Dövlət Universiteti
dissertant
ilkanaamirova@yahoo.com

# QƏDİM İNGİLİS DİLİNDƏ "MEŞƏ" SÖZÜNÜN İŞLƏNMƏ YERİ VƏ FORMALARI

**Xülasə**

Məqalədə meşə konseptinin linqvistik mahiyyəti, qədim ingilis dilində meşə sözünün işlənmə yeri və formaları haqqında məlumat verilir. Məqalədə göstərilir ki, meşə anlayışlı sözlər digər dillərdə olduğu kimi, qədim ingilis dilində də işlənmişdir. Bu da təbii idi, çünki meşə məfhumu insan üçün ilk məfhumlardan biri olmuşdur. Həmin amilə görə meşə konseptini insan təfəkküründə baza konseptlərdən hesab etmək olar. İngilis dilində meşə semantikasını ifadə edən sözləri müxtəlif metaforik modelləri mövcuddur. Bu metaforik modellərin çoxluğu meşə sözünün nominativ funksiyalardan əlavə olaraq, poetik funksiyalarının da çoxluğunu sübut edir, meşə konseptinin periferiyalarının zənginliyini göstərir. Meşə konsepti ilə bağlı olaraq ingilis dilinə aid mətnlərdəki mövcud empirik materiallar bu konseptin aktuallığını göstərir. Meşə konseptinin mental fenomenliyi ondadır ki, bu konsept struktur baxımdan nüvə və periferiyalarının çoxaspektliliyi ilə diqqəti cəlb edir. Meşə konseptinin prezentasiyalarında müxtəlif obrazların kontaminasiyası müşahidə olunur. Bu baxımdan ingilis linqvokulturologiyasında meşə ən mühüm konseptlərdən biri hesab oluna bilər. İngilis linqvokulturologiyasında meşə konseptinin reprezentasiyası həm leksemlər, həm də sintaktik vahidlər və sintaktik konstruksiyalar şəklində reallaşır.

***Açar sözlər:*** *koqnitiv dilçilik, meşə, konsept, qədim ingilis dili, leksem, reprezentasiya*

**Ilkana Rabil Amirova**
Baku State University
dissertatist
ilkanaamirova@yahoo.com

## Location and forms of the word "forest" in old English

**Abstract**

The article provides information about the linguistic essence of the concept of forest, the place and forms of the word forest in Old English. The article shows that words with the concept of forest were used in Old English as well as in other languages. This was natural, because the concept of forest was one of the first concepts for man. Due to that factor, the forest concept can be considered one of the basic concepts in human thinking. There are various metaphorical models of words expressing forest semantics in English. The abundance of these metaphorical models proves the abundance of poetic functions of the word forest in addition to the nominative functions, and shows the richness of the periphery of the forest concept. Regarding the forest concept, the existing empirical materials in the English language text show the relevance of this concept. The mental phenomenality of the forest concept is that this concept attracts attention with the multifaceted nature of its core and periphery from a structural point of view. In the presentations of the forest concept, the use of various images is observed. From this point of view, the forest can be considered one of the most important concepts in English linguistics and culture. The representation of the forest concept in English linguistics and culture is realized in the form of both lexemes and syntactic units and syntactic constructions.

***Keywords:*** *cognitive linguistic, forest, concept, old English, lexeme, representation*

## Giriş

İnsan dünyanı konseptlər formasında dərk edir. Bu konseptlərin məcmusu insan idrakında dünyanın ümumi mənzərəsini yaradır. Belə konseptlərdən biri də meşə konseptidir. Meşə anlayışı, ilk növbədə, landşaft anlayışı ilə bağlıdır, landşaft konseptsferasına daxildir. Meşə konseptinin

semantik cəhətdən məkan, landşaft, mənzərə, ağac, təbiət, ekologiya konseptləri ilə birbaşa bağlılığı var. Təbiət, landşaft və məkan konseptlərini makrokonseptlər hesab etmək olar.

Konseptlər arasında məkan, yer konseptinin özünəməxsus mövqeyi var. Bu konsept müxtəlif diskurs tiplərində özünəməxsus cəhətlərə malikdir. İstər semantik sahə nəzəriyyəsi baxımından, istərsə də koqnitiv dilçilik baxımından məkan konseptinin səciyyəvi xüsusiyyətlərinin araşdırılması mühüm dil faktlarının aşkarlanmasına şərait yaradır. Məkan makrokonseptinə daxil olan anlayışlardan biri də meşə konseptidir. Meşə dünya ekosistemində mühüm amillərdən biri hesab oluna bilər. Yer Kürəsindəki biosistemdə meşə landşaftın ən mühüm areallarından biridir. Meşə həm landşaft konsepti kimi, həm də məkan konsepti kimi səciyyəvi koqnitiv xüsusiyyətlərə malikdir. Meşə konsepti hər şeydən öncə insan təfəkküründə bitki aləmi anlayışını canlandırır. Bu konsept, hər şeydən öncə, insanı əhatə edən təbii mühiti, insan fəaliyyətinin başlıca sahələrindən birini əks etdirir. 2012-ci ildən etibarən 21 mart tarixi dünyada Beynəlxalq Meşələr Günü kimi qeyd olunur. Bu günün bütün dünyada qeyd olunması meşə konseptinin dünya xalqlarının etnopsixologiyasında və etnoqrafiyasında əhəmiyyətli yer tutduğunu sübut edir.

Meşə və ağac anlayışları, güman ki, ilk insanların təfəkküründə əsaslı yer tutan konseptlərdir. Heç təsadüfi deyil ki, dünya mifologiyasında ən qədim miflərdən biri "Dünya ağacı" mifidir. Bu mifin digər adı isə "Həyat ağacı"dır. Həmin mif haqqında hətta xristianlıq dininin müqəddəs kitabı sayılan "Bibliya"da məlumat verilmişdir. Məlumdur ki, mifoloji təfəkkür dünya xalqlarının dillərindəki ən qədim leksik-semantik layları özündə ehtiva edir.

Dünya xalqlarının təbiət kultunda ağac və meşə ruhlarına inanc ideyası mühüm konsepsiyalardandır. Meşə konsepti dünyanın ümumi mənzərəsinin bir parçası kimi müxtəlif xalqların linqvokulturologiyasında aparıcı konseptlərdəndir. Çünki meşə hər şeydən öncə, insan təfəkküründə dünyanın bir mənzərəsi, təbiətin ayrılmaz tərkib hissəsi, landşaftın bariz bir nümunəsi kimi canlanır. Meşə konseptinə bir neçə prizmadan yanaşmaq olar. Belə ki, meşə konsepti ilk növbədə coğrafi termin kimi önəmlidir. Bioloji baxımdan yanaşdıqda, meşə təbiətin bir parçası kimi bioloji varlıqların yaşadığı, flora və fauna aləminə sahib yerdir. Ekoloji baxımdan yanaşsaq, meşə canlılar üçün oksigen mənbəyidir. Linqvokulturoloji baxımdan yanaşsaq, meşə dünya xalqlarının etnokulturologiyasında özünəməxsus yer tutan ən mühüm konseptlərdən biri sayıla bilər. Meşə ilə bağlı dünya xalqlarının şifahi və yazılı ədəbiyyatında dərindən iz buraxmış, xalqların genetik yaddaşında həkk olunmuş mifik obrazlar, sakral terminlər, paremiyalar (aforizmlər, atalar sözləri və məsəllər), idiomlar yaranmışdır.

Meşə konsepti dünya xalqlarının linqvokulturologiyasında universal konseptlərdən biri sayıla bilər. Ancaq universal mahiyyətinə baxmayaraq hər bir xalqın mental düşüncəsində meşə konseptinin spesifik etnoxüsusiyyətləri də mövcuddur. Bu cəhətdən meşə konsepti milli xüsusiyyətlərə də malikdir. Meşə konsepti peyzaj simvolikasında aparıcı yerlərdən biri kimi miflərdə, əfsanələrdə və nağıllarda, frazemlərdə, paremiyalarda əhəmiyyətli mövqeyə malikdir. Meşə konseptinin mahiyyətini anlamaq üçün ilk növbədə, folklor mətnlərinə müraciət etmək lazımdır. Çünki məhz folklor diskursunda meşə konsepti ilə bağlı ilkin təsəvvürlər, assosiasiyalar ifadə olunur.

İndiyə qədər həm folklorşünaslıqla bağlı aparılan araşdırmalarda, həm də linqvistik araşdırmalarda meşə bir konsept olaraq hər zaman aktuallıq qazanmışdır. Folklorşünaslıqda nağıl və mifologiya ilə bağlı araşdırmalarda meşə mövzusu tədqiqatçıların hər zaman diqqətini cəlb etmişdir. Linqvistik araşdırmalarda isə istər etimologiya ilə bağlı, istər leksik, istərsə də frazeologiya ilə bağlı, istərsə də konseptlərlə bağlı araşdırmalarda meşə məfhumu müxtəlif paradiqmalardan öyrənilmişdir. Bütün bunlar da səbəbsiz deyil. Çünki meşə konsepti öz dərin semantik strukturuna, nominativ sahəsinə, arxetiplərinə, nüvə və periferiyalarına, freym və assosiasiyalarına görə fərqlənən səciyyəvi konseptdir. Bu konseptin koqnitiv analizi linqvokulturoloji və etnolinqvistik baxımdan əhəmiyyətli dil faktlarının təsbit olunmasına imkan verir. Bu konseptin şərhi təbiətin ayrılmaz tərkib hissəsi olan meşə məfhumunun insan təfəkküründə və bəşər dilində paralel olaraq hansı fazalarda, hansı vasitələrlə inikas olunma yöntəmlərini üzə çıxarır. Meşə dünyanın bir mənzərəsi kimi qədim mifologiyada aparıcı mövzulardan biri olmuşdur. Mifoloji mətnlərdə ağac və meşə dünyanın kosmik strukturunun əsas komponentlərindəndir. Çünki mifologiyada dünyanın

yaradılışı, həyatın mənbəyi haradandır? sualına cavab axtarılır. Meşə konseptinin kosmoqonik mahiyyəti də məhz bununla bağlıdır.

Meşə anlayışlı sözlər digər dillərdə olduğu kimi, qədim ingilis dilində də işlənmişdir. Bu da təbii idi, çünki meşə məfhumu insan üçün ilk məfhumlardan biri olmuşdur. Həmin amilə görə meşə konseptini insan təfəkküründə baza konseptlərdən hesab etmək olar. İngilis mentalitetində bəzi ağac növləri müqəddəs hesab olunur. Onlardan birincisi palıd (oak) ağacıdır. Məsələn, İngiltərənin cənub-qərbində Qlastonberi adlanan ərazidə Avalon palıdı (Oaks of Avalon) adlanan iki qədim palıd ağacı müqəddəs sayılır. Həmin iki palıd ağacı “Bibliya”da adı çəkilən Qoq və Maqoq adlanan iki qədim xalqı simvolizə edir. Xristianlıqdan qabaq Avropa xalqlarının bir çoxunun dini inanc sistemlərində ağac və meşə kultu dominantlıq təşkil edirdi. Alman və slavyan paqanizmində ağac və ya meşə simvolikası sakral anlam kəsb edirdi.

Müasir ingilis dilində meşə anlayışı, əsasən, iki sözlə: *forest* və *wood* sözləri ilə ifadə olunur. Məsələn: “*From the pond* ***in the wood*** *where the wild deer sup”* (Kipling, 22); “*Mowgly was far and far through* ***the forest****, running hard and his heart was hot in him”* (Kipling, 15). İngilis dilində “meşə yolu” anlamında *wood-path* sözü də işlənir:

*“A blow more or less is nothing to thee, Bagherra or Baloo, I – I have to wait and wait for days in a wood – path and climb half a night on the mere change of a young ape”* (Kipling, 33). İngilis dilində *forest* sözü həm də feil kimi, “ağaclarla örtülmək” anlamındadır.

Ancaq ingilis dilində “meşə” anlamlı digər sözlər də mövcuddur: *woodland, grove, jangl* və s.

Qədim ingilis ədəbiyyatına aid olan “Dream of Rood” (Rudun arzusu) adlı poemada *trees of the forest* (yəni “meşə ağacları”) ifadəsi mifoloji anlamda işlənmişdir: “*Listen! the King of glory,*
*Guardian of heaven’s kingdom*
*honored me over all the trees of the forest,*
*just as he has also, almighty God, honored*
*his mother, Mary herself*” (5, s.3). Məlumdur ki, indiki ingilislər german və anqlo-sakson tayfalarının birləşməsindən yaranmışlar. Qədim german mifologiyasında ağac və meşə kultu var. Həmçinin qədim german mifologiyasında *sehrli meşə* (sacred grove) anlayışı var.

Marvud (Marwood) adlanan ingilis yazıçısının 1598-ci ildə yazdığı “Lawes of Forest” (“Meşə qanunları”) adlı əsərində qeyd olunur ki, “*forest sözü o zamanlar, yəni orta əsrlərdə ingilis dilində “kral ailəsinə aid orman” anlamında işlənirdi*” (Porteus, 2002: 34).

İngilis dilində meşə ilə bağlı olan leksemlərdən bir *forester* sözüdür. *Forester* sözünün qədim anlamı “meşədə yaşayan insan və yaxu da heyvan” olmuşdur. Müasir ingilis dilində isə bu söz Azərbaycan dilindəki “meşəbəyi” (yəni meşəni mühafizə edən şəxs) mənasındadır.

İngiltərə ərazisində meşə massivləri çox olduğuna görə, meşə adları, meşə apelyativi ilə bağlı toponimlər kifayət qədərdir. Onlardan biri *Arden Forest* adlanır. Həmin ərazi Avon çayından Temza çayına qədər olan böyük bir ərazini əhatə edir. İngilis dilində *Royal Forests* ifadəsi “Kral Meşələri” anlamındadır. İngilis dilində “meşə” mənasında aktiv işlənən *forest* sözünün mənşəyi, kökü qədim latın dilində işlənən *foris* “kənar, xaric, bayır, çöl, qapıdan kənar” sözü ilə bağlıdır. Bəzi qədim mənbələrə görə, ingilis dilində işlənən *forest* sözünün ilkin forması latın dilində işlənən *foresta* sözü olmuşdur. Həmin söz də, əslində, *fera* və *statio* sözlərinin birləşməsindən yaranmış mürəkkəb söz olmuşdur, mənası isə “vəhşi heyvanlar üçün təhlükəsiz yer”dir. Daha sonralar həmin söz ingilis dilində *forest* formasına keçmişdir, *for* “üçün”, *rest* “istirahət” deməkdir. Yəni *forest* sözünün ilkin mənalarından biri “ingilis kralları üçün istirahət yeri” olmuşdur (Harrison, 1992: 73). Həmin söz uzun müddət ilkin orta əsrlərdə ingilis dilində *forestis silva* (“kənar meşə”) şəklində işlənmişdir. Orta əsrlərdə İngiltərədə kral ailələrinə, şahzadə ailələrinə, zadəgan ailələrinə mənsub olan meşələr mövcud idi. Həmin meşələrdə əsilzadə ingilis şahzadələri ov edirdilər. Vaxtilə bu ifadə işlənəndə İmperator Çarlemaqnenin ovçuluq ilə məşğul olduğu yerlər nəzərdə tutulurdu. Yəni orta əsrlərdə ingilis dilində bu söz ancaq “ov edilən meşəlik” anlamını ifadə edirdi, dar mənada idi. Burada *silva* “meşəlik ərazi” *(woodland), forestis* isə “çöldə, bayırda” *(outdoor, outside)* deməkdir. İtalyan dilində *foresta* formasındadır. İngilis dilinin etimoloqu E.Kleyinin fikrincə, “*forestis sözü latın mənşəli forum “ictimai yer” kökündən yaranmışdır*” (Klein, 1966: 611). *Silva* “meşə” sözü latın mənşəlidir. *Forest* sözü latın dilindən qədim fransız dilinə keçmişdir, sonra isə fransız dilindən

ingilis dilinə keçmişdir (5). Qədim fransız dilində *forest*, alman dilində *forst,* müasir fransız dilində *foret* formalarındadır (Chambers`s, 1874: 191). Deməli, tarixən *forest* sözü ingilis dilində semantik genişlənməyə məruz qalmışdır. Ümumiyyətlə, həmin söz hind-Avropa dillərində *foresta, foret, forst* və s. şəkillərində işlənir. İngilis dilində *forest* sözü, əslində, hüquq termini kimi yaranmışdır. Məhz bununla bağlı ingilis dilində *forest law* "meşə qanunu" ifadəsi yaranmışdır (Harrison, 1992: 69).

Qədim ingilis dilində meşə məfhumunu bir neçə söz ifadə etmişdir. Məsələn, qədim ingilis dilində *ceart* sözü "meşə" anlamında işlənmişdir (Makovski, 1996: 134). Eyni zamanda qədim ingilis dilində *widu // wudu* sözü həm "meşə", həm də "ağac" anlamlarını ifadə etmişdir. İngilis dili ilə qohum olan irland dilində isə *fid* sözü "ağac və meşə" mənasındadır (Makovski, 1996: 135). İngilis dili ilə genetik cəhətdən qohum olan german dillərinə aid müasir alman dilində *wald* sözü "meşə" semantikasını ifadə edir. Həmin söz də *wood* sözü ilə eyniköklüdür. Bu söz vaxtilə qədim german dillərində *witu, widu* formalarında işlənərək "həm "meşə", həm də "ağac" anlamlarını ifadə etmişdir. Vaxtilə ingilis-sakson dilində *weald, wudu* formalarında işlənmişdir. Qədim ingilis dilində, əsasən, *weald* formasında olmuşdur. Müasir uels dilində *gwood* şəklindədir (Makovski, 1996: 564). İngilis dilində *woodman* sözü "ağackəsən, meşə mühafizəçisi" mənalarındadır.

İngilis dilində meşə ilə bağlı sakral sözlər mövcuddur. Belə sözlərdən biri *wood-nymph* və ya *woodnimf* "ağac və ya meşə Allahı, meşə ilahəsi" leksemidir (Makovski, 1996: 565). Həmin söz ingilis dilinə qədim yunan dilindən keçmişdir. Belə ki, bu ad yunan mifologiyasında olan Nymphs adlanan mifik bir obrazın adı ilə bağlı yaranmışdır. Nympha yunan mifologiyasında dəniz, meşə, ağac ilahəsinin adıdır.

Yuxarıda verdiyim örnəklər sübut edir ki, qədim ingilis dilində "meşə" anlayışı *forest* sözü ilə yanaşı, digər sözlərlə də ifadə edilmişdir. Qədim ingilis dilində *ceart* "meşə" və *widu* "meşə" sözləri paralel şəkildə işlənmişdir (Makovski, 1996, 134-135). Xatırladaq ki, hind-Avropa dillərində *forest* sözü ilə eyniköklü olan sözlər işlənmişdir: qədim ingilis *furh* "küknar", qədim island *fura* "küknar", qədim alman *forha* "küknar", *furi* "küknar meşəsi" (Qamkrelidze, 1984: 614). Güman etmək olar ki, qədim ingilis dilində işlənən *widu* "meşə" sözü müasir ingilis dilində işlənən *wood* "ağac, meşə" sözünün ilkin formasıdır.

Qədim ingilis dilində *beam* "ağac" sözü də işlənmişdir. Vaxtilə müxtəlif german dillərində *ağac* anlamı fərqli sözlərlə ifadə olunmuşdur. Məsələn, qott dilində *bagms* "ağac", qədim alman dilində *boum* "ağac", qədim irland dilində *bile* "ağac", qott dilində *bloma* "çiçək" sözləri işlənmişdir (Qamkrelidze, 1984: 467). Çox güman ki, müasir ingilis dilində işlənən *blooming* "çiçəkləmək" feili bu kökdən təşəkkül tapmışdır. Qeyd edək ki, biologiya termini kimi işlənən *flora* sözü qədim latın dilində *Flora* "bitki ilahəsi" sözündən yaranmışdır.

Qədim ingilis dilində *firgen* sözü "dağ meşəsi", qədim alman dilində isə *virqunt* sözü "meşəli dağ" mənasında işlənmişdir. Müasir alman dilində isə *forst* "küknar meşəsi" mənasını ifadə edir (Qamkrelidze, 1984: 614). Faktlardan göründüyü kimi, qədim ingilis dilində *dağ meşəsi* anlamı fərqli sözlərlə ifadə edilmişdir. Müasir ingilis dilində isə *dağ meşəsi* anlayışı *mointain forest* birləşməsi ilə, *meşə ağacı* anlayışı isə *forest tree* birləşməsi ilə ifadə olunur.

Müasir ingilis mentalitetində meşə ilə bağlı işlənən ifadələrdən demək olar ki, ən birinciləri *lovely forest, lovely wood, beautiful forest, pretty forest* ifadələridir. Əgər bu ifadələr Britaniya ingiliscəsi üçün səciyyəvidirsə, Amerikan ingiliscəsi üçün *aesthetic forest* (yəni "çox gözəl meşə") ifadəsi daha xarakterikdir. İngilis nağıllarında *dark wood, dark forest, black forest* ("qaranlıq meşə") anlayışları simvolik anlamda sehrli qüvvələrin yaşadığı məkandır. *Dark forest* ifadəsi ingilis dilində "vahiməli meşə" anlamını da ifadə edir. İngilis nağıllarında *vahiməli meşə* anlamına tez-tez rast gəlmək mümkündür.

Vaxtilə İngiltərədə kralların ayrıca ov meşələri olub ki, onlar həmin kralların mülklərinə daxil idi. Həmin ərazilərə giriş xüsusi icazə ilə olmuşdur. Buna görə də orta əsrlərdə ingilis təsəvvüründə *forest,* yəni "meşə", ilk növbədə, xüsusi mülkiyyət sayılırdı.

Müasir ingilis dilinin leksik imkanları çox geniş olduğuna görə ingilis dilində *zülmət meşə* anlamını fərqli söz birləşmələri ilə ifadə etmək mümükndür. Məsələn: *a gloomy forest* "tutqun, zülmət meşə", *a gloomy wood* "zülmət meşə", *twilight forest* "zülmət meşə" və s.

## Nəticə

1870-ci ildən başlayaraq Amerika Birləşmiş Ştatlarında Arbor Day deyilən bir bayram keçirilir. Bu bayram hər il aprel ayında minlərlə ağacın əkilməsi ilə bağlı keçirilən bir bayramdır. Hazırda dünyanın bir çox ölkələrində həmin bayram qeyd olunur. Bu bayram birbaşa Amerikan ingiliscəsində ağac kultunun reliktini daşıyır.

Amerikan ingilscəsində *holt* "meşə, meşəli təpə" sözü də işlənir. Eyni zamanda ingilis dilində "kiçik meşə" anlamında *grove* sözü də var. Həmin söz vaxtilə ingilis-sakson dilində *graef* və yaxud *groue* şəkillərində işlənmişdir. İngilis etimoloqu Çamberles bu sözün kökünü *grave* "kəsmək" feili ilə əlaqələndirir (Chambers`s. 1874: 214-217). Müasir ingilis dilində *hurst, copse, coppice, bosk* sözləri də "meşə" semantikasını ifadə edir. Ancaq onlar *forest, wood* və *grove* sözləri ilə müqayisədə məhdud şəkildə işlənir. Amerikan ingiliscəsində *bosquet* və *boscage* sözləri "kiçik meşə" anlamında işlənməkdədir. Həmin söz alman mənşəli *bosc* "meşə" kökündən yaranmışdır. Bu söz orta ingilis dili mərhələsində *bosgace* şəklində, qədim fransız dilində isə *boscage* şəkillərində işlənmişdir.

## Ədəbiyyat

1. Kipling, R. The Jungle Book. https://issuhub. com/view/index/29361
2. Porteus, A. (2002). The Forest in Folklore and Mythology. New York: Mineola, 319 p.
3. Harrison, R. (1992). Forests: The Shadow of Civilization. Chicago: The University of Chicago Press, 304 p.
4. Klein, E. (1966). Comprehensive Etymological Dictionary of the English Language. Amsterdam-London-New York: Elsevier Publishing Company. 1776 p.
5. https://pacificaoc.org/wp-content/uploads/2019/05/Dream-of-the-Rood.pdf
6. Chambers`s. Etymological Dictionary of the English Language. (1874). London and Edinburg: W & R.Chambers.
7. Makovski, M. (1996). Hind-Avropa dillərində mifoloji simvolların müqayisəli lüğəti. Dünyanın obrazı və obrazlar aləmləri. Moskva: VLADOS Humanitar Nəşriyyat Mərkəzi. 416 s.
8. Qamkrelidze, T. (1984). Hind-Avropa dili və Hind-Avropa dili: (2 cilddə). Tbilisi: Tbilisi Universitetinin nəşriyyatı, T.2., 1328 s.
9. https://www.pdfdrive.com/the-american-heritage-dictionary-of-the-english-language-third-edition-d162169029.html

Göndərildi: 21.07.2022 Qəbul edildi: 10.09.2022

DOI: https://doi.org/10.36719/2706-6185/15/18-25

**Nurlan Ramiz oğlu Məmmədov**
Bakı Slavyan Universiteti
doktorant
nurlan.mammadov.r@bsu-uni.edu.az

# AZƏRBAYCANDA ƏLAVƏ TƏHSİLİN TƏŞKİLİNİN ƏSAS İSTİQAMƏTLƏRİ VƏ TƏŞKİLİ MODELLƏRİNƏ DAİR

**Xülasə**

Bazar iqtisadiyyatının və yeni iqtisadi münasibətlərin formalaşması, yüksəksürətli informasiya və yüksək texnologiyaların inkişafı ilə əlaqədar olaraq cəmiyyətin hər bir fərdi şəxsi istər sosial, istər iqtisadi, istərsə də mədəni sahədə köklü dəyişikliklərin bilavasitə iştirakçısına çevrilir. Yeni qlobal və meqa iqtisadi institutlar yeni iş formaları, bilik və bacarıqlar yaradır, təkmilləşdirir, tələb edir və qiymətləndirir. Bu zaman kapital maddi resurslara deyil, əmək ehtiyatlarına və sosial resurslara qoyulur. Qloballaşan dünyada bilik və informasiya sürətlə dəyişdiyindən, bir dəfəlik təhsil insanın bütün həyatı boyu inkişafını təmin edə bilmir. Hətta ən qabaqcıl təhsil sistemində belə əldə edilən biliklərin əksəriyyəti tədris prosesi başa çatdıqdan bir müddət sonra öz aktuallığını itirir. Hazırda elm və texnika elə sürətlə inkişaf edir ki, hər il orta hesabla biliklərin 30 faizə yaxını "köhnəlir", bir neçə ildən sonra peşə və ixtisasların məzmunu inkişafla ayaqlaşmır və zərurət yaranır. Onu yeniləyin. Cəmiyyətin sosial, iqtisadi, siyasi, mədəni həyatında fəal iştirak etmək üçün hər bir insanın öz peşə və peşə bacarıqlarını, şəxsi keyfiyyətlərini həm kəmiyyət, həm də keyfiyyət baxımından yeniləməsi, zənginləşdirməsi və dövrün tələblərinə uyğunlaşdırması zəruri olur. Azərbaycan Respublikasında əlavə təhsilin tarixinin öyrənilməsi təhsilin fasiləsizliyi prinsipi əsasında yeni modellər əsasında əlavə təhsilin daha səmərəli təşkilinin işlənib hazırlanmasına yeni baxışın və konsepsiyanın formalaşdırılması baxımından mühüm əhəmiyyət kəsb edir.

***Açar sözlər:*** *dövlət proqramı, təhsil islahatları, ixtisasartırma, ixtisasartırma, stajkeçmə, yaşlıların təhsili, əlavə təhsil, fasiləsiz təhsil*

**Nurlan Ramiz Mammadov**
Baku Slavic University
PhD student
nurlan.mammadov.r@bsu-uni.edu.az

## About the main directions and organizational models of the organization of additional education in Azerbaijan

**Abstract**

In connection with the formation of a market economy and new economic relations, the development of high-speed information and high technologies, each individual of the society becomes a direct participant in fundamental changes in both social, economic and cultural spheres. New global and mega economic institutions create, improve, demand and evaluate new forms of work, knowledge and skills. In this case, investment does not invest in material resources, but in labor resources and social capital. As knowledge and information change rapidly in a globalized world, once an education is obtained, it cannot ensure a person's development throughout their life. Most of the knowledge gained even in the most advanced education system loses its relevance some time after the completion of the educational process. Nowadays, science and technology are developing at such a pace that every year on average about 30 percent of knowledge "becomes obsolete", after a few years the content of professions and specialties does not keep up with development, and there is a need to update it. For active participation in the social, economic, political, cultural life of society, it becomes necessary that each person updates, enriches and adapts to the requirements of the time their professional and professional skills, personal qualities both in quantitative and qualitative terms. The study of the history of additional education in the Republic of Azerbaijan is important for forming a new view and concept of developing a

more effective organization of additional education based on new models based on the principle of continuity of Education.

***Keywords:*** *state programme, education reforms, improvement of professional skill, retraining of specialists, internships, adult education, additional education, continuing education*

## Giriş

Azərbaycan Respublikasında fasiləsiz təhsil sistemində əlavə təhsilin yeni modellər əsasında təşkili 2000-ci ildə Ümummilli lider Heydər Əliyevin Azərbaycan Respublikasında təhsil sisteminin təkmilləşdirilməsi haqqında imzaladığı 13 iyun tarixli, 349 nömrəli Fərmanı ilə genişmiqyaslı təhsil islahatları çərçivəsində başladıldı. Qeyd edək ki, 2000-ci ilədək əlavə təhsil sistemində islahatların həyata keçirilməsi ilə bağlı artıq hüquqi baza mövcud idi. 11 iyul 1997-ci il tarixli, 77 nömrəli İxtisasartırma və kadrların yenidən hazırlanması müəssisələrinin nümunəvi əsasnamə (1) və Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramının təsdiq edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 15 iyun 1999-cu il tarixli 168 nömrəli Sərəncamı (2) Azərbaycanda əlavə təhsil sisteminin dünya təhsil standartları əsasında yenidən formalaşdırılması ilə bağlı ilk normativ-hüquqi aktlar olmuşdur.

1999-cu il Təhsil sahəsində İslahat Proqramının 2.1; 2.3.2 və xüsusilə 2.3.3 Başqa sahələr üçün kadr hazırlığı hissəsində yeni istehsal-mülkiyyət münasibətlərinin, beynəlxalq iqtisadi əməkdaşlığın, respublika iqtisadiyyatının dünya iqtisadiyyatına inteqrasiyasının, eləcə də respublika iqtisadiyyatına yeni texnologiyanın diversifikasiyasının tələblərinə uyğun mövcud kadr potensialının ixtisasartırma, yenidən hazırlanma və əlavə təhsilinin təşkili təxirəsalınmaz vəzifə kimi qeyd olunmuşdur.

İslahat Proqramı çərçivəsindəki fəaliyyət 2000-ci il 13 iyun tarixli Prezident Fərmanı (3) ilə daha da dərinləşdirilmiş, diplomdansonrakı təhsildə aparılan islahatlar öz məntiqli davamı üçün bir növ əlavə dəstək almışdır. Məhz bu Fərmana uyğun olaraq Azərbaycanın təhsil sistemində müəllim hazırlığının dünya ölkələrindəki təcrübəyə əsaslanan konseptual strategiyası müəyyənləşdirilmiş, ilkin və diplomdan sonrakı müəllim hazırlığı pillələri beynəlxalq modellərə uyğunlaşdırılaraq, onlara bir-birini tamamlayan proseslər kimi baxılmış, fasiləsiz təhsil kontekstində ilk dəfə olaraq həmin pillənin yeni şəbəkəsi yaradılmışdır. Beləliklə, müəllim hazırlığı üzrə dünya təcrübəsinə inteqrasiya prinsipi zəruri faktor kimi qəbul edilmiş, həmin istiqamətdə konkret fəaliyyət həyala keçirilmişdir. Belə ki, Fasiləsiz təhsil hamı üçündür konsepsiyası verilmiş, ilk dəfə olaraq ixtisasartırma, yenidənhazırlanma təhsili, stajkeçmə və təkmilləşdirmə proseslərinin dəqiq çərçivələri müəyyənləşdirilmiş, modern tələblərə cavab verən dayaq-məntəqələri mexanizmi hazırlanmış, burada təhsil prosesinin təşkili modeli formalaşdırılmış, məntəqələrin dislokasiyası müəyyən edilmiş, cəlb olunan kontingent bazası barədə geniş informasiya bankı yaradılmışdır.

Azərbaycan Respublikası Təhsil nazirinin 21.02.2002-ci il tarixli, 164 nömrəli əmrinə əsasən, dayaq məntəqələrində təsdiq olunmuş mexanizmə uyğun aparılan işin ilk növbədə eksperiment zonalarına tətbiqi müəyyənləşdirildiyindən həmin bölgələrdə müvafiq izahat işlərinin aparılması üçün 2002-ci ilin fevral-mart aylarında zona müşavirələri keçirilmiş, dayaq məntəqələri üzrə eksperiment aparmaq üçün Bakı şəhərinin Səbail rayonu. Gəncə. Sumqayıt və Şəki şəhərləri və Cəlilabad rayonu müəyyənləşdirilmişdir ("Azərbaycan müəllimi" qəzeti, 2009: 2).

Təhsil Nazirliyinin 2000-ci il aprel kollegiyasında bu aktual problemin həlli üçün özündə 16 konkret strateji addımı birləşdirən xüsusi Plan qəbul edilmiş, həm ixtisasartırma, həm də yenidənhazırlanma təhsilinin təşkili modelləri layihə formasında pedaqoji ictimayyətin geniş müzakirəsinə verilmişdir. Qərarın icrası ilə əlaqədar Sifariş-təklif modelinin tətbiqi üçün strategiya da hazırlanmışdır (5). Bütün bunlar məzmun aspektində çox variantlılıq, tələbata uyğunluq prinsiplərinin reallaşdırılmasına səbəb olmalı idi. Bu pillədə qlobal, geniş miqyaslı islahatların aparılmasından əvvəl radikal addımlar atılaraq 1000-dən artıq ana dili və ədəbiyyat, eləcə də riyaziyyat müəllimlərinin ixtisasartırma təhsilinə olan real tələbatı öyrənilmiş, çoxsaylı mütəxəssislərdən ibarət işçi qrupları tərəfindən bu tələbatların qruplaşdırılması işi aparılmış, nəticədə hər iki ixtisas üzrə ixtisasartırma təhsili üçün məzmun baxımından tələbatı tam əhatə edən 40-a yaxın çoxvariantlı tədris plan-proqramları hazırlanmışdır. Güclü ekspertizadan keçirilmiş bu tədris sənədləri yerlərə göndərilmiş, hər bir müəllimin onun real tələbatını ödəyə biləcək çoxsaylı tədris plan-proqramlarının içərisindən özünə uyğun olanını seçməsi üçün münbit şərait yaradılmışdır. Qeyd olunmalıdır ki, pedaqoji kadrların diplomdansonrakı təhsilinin

bu cür yeni təşkili mexanizmi prosesin idarə olunmasının əksmərkəzləşmə prinsiplərinə tam uyğun aparılması kimi qiymətləndirilir.

Bundan əlavə, beynəlxalq məsləhətçilər Rob Makbraytm "Müəllim hazırlığı - pedaqoji təhsil" və Ketrin Raylinin "Müəllim fəaliyyətinin qiymətləndirilməsi və peşəkarlıq səviyyəsinin inkişafı" mövzularında apardıqları tədqiqatların nəticəsi də ixtisasartırma və yenidənhazırlanma təhsilində Azərbaycan üçün müəyyənləşdirilmiş bu yeni modelin rəsmi şəkildə dəstəklənməsinə bariz nümunə ola bilər (Bocharova, 1996: 4).

Monitorinq anket sorğularının real təhlili və müşahidələrin real vəziyyətini düzgün qiymətləndirməklə problemli məsələləri üzə çıxarmaq üçün əlverişli şərait yaratmışdır. Təhsil Nazirliyinin "Ümumi təhsil müəssisələrinin müəllimləri üçün ixtisasartırma təhsilinin kurikulum çərçivəsi" sənədində (7) bu məsələ daha geniş şəkildə əksini tapmışdır. Kurikulum çərçivəsində müəllimlər üçün ixtisasartırma təhsilinin 3 modulda həyata keçirlməsi nəzərdə tutulur ki, bu modullar peşə fəaliyyətinin ümumi əsasları, ixtisas sahələri və innovasiyalar üzrə təlimi əhatə edir. Ümumi təhsil müəssisələrinin müəllimləri üçün hər bir ixtisas artırma dövrü 5 il hesab edilir.

Pedaqoji ictimaiyyətin geniş müzakirəsindən sonra diqqətə alınmış rəy və təkliflər, eləcə də müxtəlif ekspertlərin, beynəlxalq və milli məsləhətçilərin ideya və fikirləri də nəzərə alınmaqla, adları çəkilən konsepsiya və mexanizmlərin yekun variantları hazırlanmışdır. Həmin sənədlər, ümumlikdə bütün prosesin konseptual ideyalarını özündə əks etdirmiş və ixtisasartırma və yenidənhazırlanma təhsili üçün Azərbaycan modelini formalaşdırmışdır.

Təhsil sistemində kadrların ixtisasının artırılması mexanizmi bir-biri ilə vəhdət təşkil edən və paralel şəkildə fəaliyyət göstərən 3 blokdan ibarətdir:

1) Pedaqoji kadrların fəaliyyət göstərdiyi müəssisədəki proses;
2) İxtisasartırma tədris müəssisəsindəki (struktur bölməsindəki) proses;
3) İxtisasartırma təhsilində təminat prosesi

Bu proseslər aşağıdakı ayrı-ayrı modellər üzrə həyata keçirilir:

Pedaqoji kadrların əlavə təhsilinin təşkil mexanizmində ilkin olaraq ixtisas və fənlərin konkret siyahısı tərtib olunur, həmin siyahıya uyğun fəaliyyət göstərən pedaqoji kadrların faktiki tərkibi müəyyənləşdirilir, ixtisaslar və pillələr üzrə planlaşdırılır, həmin qruplar üzrə real tələbatın öyrənilməsi istiqamətində xüsusi təhlillər aparılır, tədris, metodiki, kadr və s. sahələrdə çalışan mütəxəssislər tərəfindən hər bir pedaqoji kadrla fərdi qaydada iş aparılır, onların dərsləri dinlənilir, təhlil edilir, ekspertlər tərəfindən qiymətləndirilir, onların individual əlavə təhsil tələbatları müəyyənləşdirilir. Eyni fənləri tədris edən müəllimlərin stajlarına və ixtisasartırma pillələrinə görə üst-üstə düşən tələbatları qruplaşdırılır. Bu cür qruplaşdırma gələcəkdə təklif olunacaq tədris proqramlarının variativliyinə imkan yaradır.

Ayrı-ayrı təhsil müəssisələrində pedaqoji kadrların ixtisasının artırılması ilə məşğul olan struktur bölmələr və mütəxəssislər əlavə təhsil müəssisələri tərəfindən təklif olunan tədris proqramlarını əvvəlcədən müəyyənləşdirilmiş qruplar arasında bölüşdürürlər. Bu halda təklif olunan tədris proqramlarının qiymətləndirilməsi, onların konkret kadr üçün əlverişli olması əsas kimi qəbul edilir. Mütləq şərtlərdən biri də tam demokratik şəraitdə subyektin real imkanlarının dəqiq müəyyənləşdirilməsi və məhz həmin imkanlara uyğun planlaşdırmanın aparılmasıdır. Perspektiv planlaşdırma işində pedaqoji kadrın şəxsi arzusu, tədris prosesinin dinamikliyi, əlavə təhsil müəssisəsinin resursları, tədris proqramlarının məzmununun ehtiyaca uyğunluğu kimi kriteriyalar əsas götürülür.

## Nəticə

Bütün bu proseslər əlavə təhsil müəssisəsinə veriləcək sifarişin əsasını təşkil edir. Sifarişçilərin (tədris müəsisələrinin, təhsil orqanlarının), konkret pedaqoji kadrın tələbatını bütün hallarda ödəmək arzusunda olan təminatçı müəssisələr (əlavə təhsil xidmətləri göstərən müəssisələr, kurslar, fakültələr, şöbələr) yeni proqram hazırlığına sifarişçinin mütəxəssislərini dəvət edir, sifarişçinin tələbini tam ödəyən tədris proqramının tərtib olunmasına nail olur. Hər iki tərəfin şərtləri əks olunmaqla müvafiq müqavilələr imzalanır və beləliklə keyfiyyətli tədris prosesi reallaşmış olur.

Pedaqoji kadrların ixtisasının artırılması prosesinin nəticəsində həm sifarişçinin (tədris müəssisəsinin, təhsil orqanının), həm də subyektin (pedaqoji kadrın, təhsilalanın) maraqları dəqiq müəyyənləşdirilməlidir.

Yalnız bundan sonra obyektin (tədris müəssisələrinin, təhsil orqanlarının) maraqları aşağıdakı kimi formalaşır:

– yüksək keyfiyyət;
– yeni-müasir ideyaların tədris müəssisəsinə gətirilməsi;
– tədris müəssisəsində yeni təlim texnologiyalarının tətbiqi;
– təhsilalanlar, valideynlər qarşısında obyektin yüksək nüfuz qazanması;
– müəssisənin yüksək kateqoriya alması;
– müəssisənin attestasiya, akkreditasiya kriteriyalarına cavab verə bilməsi;
– istinad müəssisəsi, baza kafedrası, baza müəssisəsi statusunun qazanılması.

Subyektin (təhsilalanın) maraqları:

– yeni biliklərə yiyələnmək;
– digər pedaqoji kadrlarla rəqabətdə üstünlük qazanmaq;
– təlim keyfiyyətinin yüksək göstəricilərinə nail olmaq;
– öyrədənləri öyrədənə statusunu almaq;
– elmi yaradıcılıqla, elmi axtarışlarla məşğul olmaq imkanını qazanmaq;
– attestasiyadan müvəffəqiyyətlə keçmək;
– yüksək stimul əldə etmək.

Əlavə təhsilinin nəticəsi olaraq təhsilalanın (müdavimin, dinləyicinin) iş yerində aşağıdakı addımlar atılır:

Təlim-tərbiyə müəssisəsində çalışan pedaqoji kadrın ixtisasının artırılması həyata keçdikdən sonra onun nəticələri müəssisədə geniş müzakirə olunur. Bu zaman ixtisasını artıran qazandığı yeni biliklər haqqında ətrafı hesabat verir, onların prosesə tətbiqi üçün öz fikirlərini şərh edir, perspektiv planlarından danışır. Müəssisə tərəfindən ona müxtəlif tövsiyələr verilir, qazandığı yeni bilikləri yaymaq üçün konkret şərait yaradılır. Müəssisə həm pedaqoji kadrın əlavə təhsilinin nəticələrini, həm də əlavə təhsil xidməti göstərən müəssisə (yaxud onun struktur bölməsi) tərəfindən təklif olunan əlavə təhsilini müvafiq qaydada qiymətləndirir. Yaxşı qiymətləndirilmə halında əvvəlki əməkdaşlıq davam etdirilir. Pis qiymətləndirilmə halında isə müqavilələr ləğv edilir, sonrakı əməkdaşlıqdan imtina olunur və başqa əlavə təhsil xidmətləri göstərən müəssisəsi axtarılır. Hər iki halda həm obyekt, həm də subyektin özü alternativ variantlardan istifadə elməkdə maraqlıdır. Belə ki, daha səviyyəli təhsil təklif edən əlavə təhsil müəssisələrinə (struktur bölmələrinə) yeni müraciətlər olunur.

Əlavə təhsil almış pedaqoji kadr öz iş yerinə qayıtdıqdan sonra, faktiki olaraq, onun əlavə təhsildən sonrakı fəaliyyət dövrü başlanır. Bu dövrdə pedaqoji kadr tədris etdiyi fənnə uyğun olan yenilikləri həm təhsil alanlara, həm gənc müəllimlərə, həm də bütün həmkarlarına çatdırmağa çalışır. Bu proses effektiv nəticə verdiyi təqdirdə pedaqoji kadr mühazirəçi statusunda fəaliyyətə başlayır, qazandığı yeni biliklərin ətrafında olan pedaqoji kadrlara ötürülməsini həyata keçirir. Bu zaman o, əldə etdiyi yeni biliklərin məcmun formasında özünün kurslarını təklif edir. Əlavə təhsil almış pedaqoji kadr fənn metodbirləşməsində, kafedrada, metodşurada və s. uyğun strukturlarda öz metodikasının üstünlüyü barədə əsaslandırılmış məlumatlar verir, bunun həqiqətən də üstün mexanizm olduğunu sübuta yetirir. O, elmi-praktik konfranslarda, seminarlarda, simpoziumlarda və s. iştirak etmək imkanı qazanır. Bütün bunlar pedaqoji kadra yüksək kateqoriya, maddi və mənəvi stimul əldə etmək üçün müvafiq iddia qaldırmağa əsas verir (Əliyeva, 2016: 40).

**İxtisasartırma təhsil müəssisəsindəki prosesin modeli** təlim-tərbiyə və peşə ixtisas təhsili müəssisələrindəki bütün kateqoriyalardan olan pedaqoji işçilər əhatə olunmaqla daxili struktur bölmələri müəyyənləşdirir. Bu bölmələrin funksiyaları prosesin əlaqələndirilməsi, tənzimlənməsi, informasiya təminatı kimi əsas istiqamətləri əhatə edir. Struktur bölmələrin funksiyaları dəqiq istiqamətləndirildiyi təqdirdə burada fəaliyyət göstərən mütəxəssislərin də fəaliyyət dairəsinin reqlamentləri dəqiq müəyyənləşdirilir. İlk növbədə təlim-tərbiyə və peşə ixtisas təhsili müəssisələrinin təsnifatı barədə informasiya bazası (data) formalaşdırılır, həmin informasiya bankına uyğun olaraq əhatə ediləcək dinləyici kontingenti bazası haqqında ətraflı məlumatlar toplanılır, bu bazanın qruplaşdırılması imkanları araşdırılır. Qeyd olunan hazırlıq işləri başa çatdıqdan sonra kafedra, kabinet, idarəetmə aparatı və s. struktur bölmələr bu və ya digər sahələr üzrə tanınmış mütəxəssisləri, ekspertləri prosesə cəlb edir, onlarla məqsədyönlü iş aparır, müvafiq rəylər öyrənilir, konkret fənn və ya ixtisaslar üzrə yerlərdə fəaliyyət göstərən pedaqoji işçilərin əsas tələbatları barədə ətraflı informasiyalar toplanılır. Həmin

informasiyalar real tələbatın müəyyənləşdirilməsi üçün ümumi tövsiyələrin hazırlanmasına əsas verir. Bu tövsiyələrdə konkret dinləyicinin hazırlıq səviyyəsinin zəif tərəfləri, onun professional maraqları və ixtisaslar üzrə yeniliklər əsas yer tutur. Kafedralar, kabinetlər variativ tədris proqramlarının hazırlanması imkanlarını araşdırır, proqram layihələrinin hazırlanması işinə başlayır. Proqram layihələrində yerlərdən daxil olan sifarişlər, təkliflər nəzərə alınır, layihələrin reallaşdırılması imkanları bir daha götür-qoy edilir. İxtisasartırma müəssisəsi və ya onun struktur bölməsi zəruri hesab edilən informasiya blokunun tədris proqramlarına daxil edilməsi üçün əsaslandırılmış təkliflər hazırlayır, dövlət standartlarına riayət olunur. Proqram layihələri ixtisasartırma müəssisəsinin elmi şurasına, metodiki şurasına, məşvərətçi orqanına təqdim edilir, onların geniş müzakirəsi keçirilir. Bu zaman Respublika Elmi-Metodik Şuranın, Tədris-Koordinasiya Şurasının, Təhsil Problemlər İnstitutunun və müstəqil eskpertlərin rəyləri öyrənilir. Bu rəylər proqram layihələrinin təsdiqi üçün əsas verir. İxtisasartırma təhsili müəssisələri bəyənilmiş və təsdiq edilmiş tədris proqramlarını müxtəlif vasitələrlə (elanlar, reklamlar, kompüter və internet ötürmələri, məktublar və s.) yerli təhsil müəssisələrinə, orqanlarına təklif edir. Bu proseslə paralel şəkildə proqramları həyata keçirəcək mühazirəçilər qrupunun hazırlanması işi həyata keçirilir. Təklif olunan tədris proqramlarına yerlərdən müsbət və ya mənfi münasibət bildirilir. Müsbət reaksiya verildiyi halda təlim-tərbiyə müəssisəsi və yerli təhsil orqanları ilə müvafiq müqavilələr, kontraktlar imzalanır, tədrisin təşkilati məsələləri həll olunur, əvvəlcədən lazımi planlaşdırma işləri aparılır. Mənfi münasibət olduqda isə tədris proqramları yenidən işlənilir. Bu zaman sifarişçilərlə (təlim-tərbiyə müəssisələri və orqanlarla) əlaqə yaradılır, onların mütəxəssisləri proqram hazırlığı prosesinə cəlb edilir, ayrı-ayrı rəylər öyrənilir, tələbatı yaradan səbəblər araşdırılır, münasib olmayan proqramlar korreksiya olunur, yeni istiqamətlər müəyyənləşdirilir. Bu halda müştərək proqramların hazırlanması da istisna olunmur. İxtisasartırma təhsilini almış pedaqoji işçi ilə müntəzəm əlaqə saxlanılır, öyrənilən bilik və bacarıqların iş prosesinə tətbiqi izlənilir. İxtisasartırma təhsil müəssisəsi öz məzununun fəaliyyətini monitorinq müşahidələr yolu ilə öyrənir, ona hamilik edir, yerlərdə kadrların periodik şəkildə yeni informasiyalarla təminatı kimi vacib prosesi reallaşdırır. Tədris-Koordinasiya Şurası ilə birlikdə kontingent bazanın respublika miqyasında tam əhatə olunması məqsədilə "Öyrədənlərin öyrədilməsi" proqramlarının yerlərdə tətbiqinə nail olunur ("Azərbaycan müəllimi" qəzeti, 2010: 3). Bu zaman istinad tədris müəssisələrinin, baza müəssisələrinin, baza kafedralarının və s. qurumların real potensialından istifadə olunur.

**İxtisasartırma təhsilində təminat prosesinin modeli** çərçivəsində ixtisasartırma müəssisələrinin maliyyələşməsinə geniş imkanlar açır. Xüsusilə əcnəbi partnyorların, beynəlxalq təşkilatların xüsusi proqramları (kreditlər, qrantlar), eləcə də qüvvədə olan müvafiq qanunvercilikdən İslahat Proqramı çərçivəsində nəzərdə tutulan mənbələrdən, həmçinin sponsorların ayırmalardan və ödənişli təhsildən gələn gəlirlərdən məqsədyönlü şəkildə istifadə edir, xüsusi kreditlərin, qrantların əldə edilməsinə, üstün maliyyələşməyə, yüksək investisiya qoyuluşuna nail olur. Bunun üçün ayrı-ayrı təşkilatlarla, müəssisələrlə qarşılıqlı əlaqələr yaradır, müvafiq müqavilələr, kontraktlar imzalayır, inkişaf layihələri, təqdim edir. Yeni məzmunlu tədris proqramlarının təminatı məqsədilə xüsusi informasiya bankını yaradaraq ondan təyinatı üzrə istifadə edir. Bu blokun əsas məzmunu tədris proqramlarını auditoriyalarda həyata keçirənlərin öyrədilməsi, onların özlərinin ixtisasının artırılması işi ilə səciyyələnir. Xarici ölkələrdə stajkeçmə, xarici ölkələrin və beynəlxalq təşkilatların aidiyyatı mütəxəssislərinin ixtisasartırma müəssisəsinə (struktur bölməsinə) gətirilməsi, internet şəbəkəsinə qoşulma imkanlarının gücləndirlməsi, partnyor müəssisələrdən, təşkilatlardan informasiyaların müntəzəm qəbul edilməsi və s. işlər tədris proqramlarını həyata keçirənlərin öyrədilməsi istiqamətində atılan ən zəruri addımlardır. İxtisasartırma müəssisəsində tədris prosesinin metodiki təminatı gücləndirilir, həm təhsil verənlərin, həm də təhsil alanların müvafiq təminat məsələləri həll edilir. Təhsil verənlər ən müasir texnika və texnologiyalardan istifadə edir, təhsil alanlar isə zəruri metodiki vəsaitlərlə təchiz olunur. İxtisasartırma təhsilində distant (məsafədən) təhsil forması xüsusi konsepsiyaya uyğun olaraq tətbiq edilir, bir növ təhsildən istifadə coğrafiyası daim genişlənir. Audio-video materiallar, yem texnika və texnologiyaları özündə əks etdirən tədris vəsaitləri mütəmadi olaraq sifarişçilərə ötürülür, xüsusi kompüter proqramları tərtib edilir, televiziya və radioda efir saatları təşkil olunur, mərkəzləşmiş kompüter şəbəkəsinin köməyilə sifarişçilərin tələbatları ödənilir. Bu istiqamətdə xaricdən daxil olan informasiyalardan, eləcə də internet şəbəkəsinin imkanlarından istifadə olunur, baza müəssisələri, baza kafedraları, baza mərkəzləri şəbəkəsi yaradılır və bu şəbəkə daim genişləndirilir.

İxtisasartırma müəssisələri tərəfindən müvafiq qaydalar gözlənilmək şərtilə "İstinad tədris müəssisələri" mexanizmi tətbiq olunur. Həmin mexanizmi həyata keçirmək məqsədilə konkret bölgədə (ərazidə) qabaqcıl tədris müəssisələri barədə geniş informasiya toplanılır və onların içərisindən daha uyğun gələni istinad tədris müəssisəsi kimi müəyyənləşdirilir,bmüəyyən olunmuş istiqamətlərdə əlaqələr yaradılır. Bu cür müəssisələrin bazasında ayrı-ayrı fənlər və ixtisaslar üzrə dayaq məntəqələri də yaradıla bilər ki, burada da pedaqoji kadrların təhsildənsonrakı səmərəli fəaliyyətini və təkmilləşdirilməsini təşkil etmək olar. Bu yolla "öyrədənlərin öyrədilməsi" proqramının reallaşdırılması, kontingent bazasının tam əhatə olunması təmin edilir. İxtisasartırma müəssisəsi yerlərdə ən yaxşı təcrübənin yayılmasında bilavasitə iştirak edərək, bu işdə maraqlı tərəf rolunu oynayır. Bütün bunlar müəssisənin göstəriciləri kimi qiymətləndirilir və onun yüksək kateqoriya almaq iddiası üçün əsas verir. Beləliklə, "ixtisasartırma müəssisəsi - yerli təlim-tərbiyə müəssisəsi - pedaqoji kadrların ixtisasının artırılması" kompleksi həyata keçirilir. İxtisasartırma təhsilinin təşkili mexanizmində nəzərdə tutulan hər bir blokda gedən proseslərin modeli zəncirvari xarakter daşıyır. Hər bir modelin həyata keçirilməsi işi isə tam paralel şəkildə apardır. Pedaqoji kadrların ixtisasartırma təhsilinə cəlb olunması fasiləsiz təhsilin özəyini təşkil edir. İxtisasartırma təhsili konkret subyektin mütəmadi şəkildə meydana çıxan tələbatı - ehtiyacı məhz elə həmin təhsil formasının həyata keçirilməsi ilə reallaşdırılır.

**Yenidənhazırlanma təhsilinə** tədris müəssisələrinin ştatlı müəllimləri ilə yanaşı, konkret istiqamətlər üzrə mühazirəçi kimi görkəmli mütəxəssislər də müvafiq qaydalar üzrə dəvət olunurlar. Tədris proqramları tam ödənildikdən sonra Təhsil Nazirliyi tərəfindən təsdiq olunmuş qaydada dövlət buraxılış imtahanları təşkil olunur. Buraxılış imtahanları dövlət imtahan komissiyası tərəfindən keçirilir. Dövlət imtahan komissiyasını tərkibi təhsil müəssisələrini rəhbərlərinin əmri ilə təsdiq olunur. Komissiyanın sədrliyinə namizəd əvvəlcədən Nazirliklə razılaşdırılmalıdır. Yenidənhazırlanma təhsilini başa vurub dövlət buraxılış imtahanlarını müvəfəqiyyətlə verən məzunlara vahid formada **diplom** təqdim edilir. Bu cür diplom ali və ya orta ixtisas təhsili haqqında sənəd deyildir. Yenidənhazırlanma diplomu məzuna onun ilkin aldığı ali və ya orta ixtisas təhsil bazasında vəzifə kateqoriyası üzrə peşə və ixtisas tələblərinə müvafiq olaraq fəaliyyət göstərmək hüququ verir. Təhsil müəssisələrində işləyən, lakin müəssisənin təqdimatı və müvafiq surətdə yerli təhsil orqanlarının göndərişi olmadan öz arzusu ilə yenidənhazırlanma təhsili olan dinləyicilərin təhsil aldıqları müddətdə iş yerinin saxlanması məsələsi Azərbaycan Respublikası Əmək Məcəlləsinin 129-cu maddəsinə uyğun tənzimlənir (10). Belə ki, təhsil müəssisələrinin daxili imkanları və şəraiti nəzərə alınmaqla, tərəflərin qarşılıqlı razılığına əsasən təhsil müddətində haqqı ödənilməyən məzuniyyət verilə bilər, bu zaman dinləyicilərin iş yeri saxlanılır, ona ezamiyyə və digər xərclər ödənilir. İşçi işəgötürənə təqdim etdiyi ərizədə təhsil haqqının özü tərəfindən ödəniləcəyi, oxuduğu müddətdə və təhsilini başa vurduqdan sonra heç bir iddia qaldırmayacağı, ezamiyyə xərci, eləcə də yeni aldığı ixtisas üzrə iş yeri tələb etməyəcəyi barədə öhdəlik götürür. Bütün hallarda yenidənhazırlanma diplomu həmin ixtisas üzrə işləmək üçün məzuna heç bir müstəsna hüquq vermir. Yalnız təhsil müəssisələrində tələbat yaranarsa, bu diplomla işləmək ümumi əsaslarla keçirilir. Respublikanın ucqar ərazilərində və dağ kəndlərində, şagirdləri və sinif komplektləri az olan məktəblərdə yerli əhalidən ibarət pedaqoji kollektivdə bir fəndən bir neçə müəllimin, digər fənlərdən müəllim çatışmazlığı olduğu hallarda sıxlıq təşkil edən fənn müəllimlərinin tələbat olan fənlər üzrə yenidənhazırlanma təhsilinə göndərilməsi təkcə müəllimlərin deyil, daha çox təhsil müəssisələrinin və yerli təhsil orqanlarının, ümumilikdə təhsilin mənafeyinə xidmət edir. Kəskin tələbat olan ixtisaslar üzrə müəllimlər yenidənhazırlanma təhsilinə göndərilərkən, həmin şəxslərin iş yerləri və orta aylıq əmək haqları saxlanmaqla, onlara müəyyən edilmiş qaydada ezamiyyə xərcləri ödənilir. Həmin xərclərin maneəsiz ödənilməsi üçün yerli təhsil orqanları vaxtında maliyyə təşkilatları ilə birgə tədbirlər həyata keçirməli, tələb olunan maliyyə vəsaiti qabaqcadan planlaşdırılıb xərclər smetasına salınmalıdır. Maliyyə məsələləri yerli maliyyə təşkilatları ilə müsbət həll olunduqdan sonra işəgötürən və yenidənhazırlanmaya göndərilən şəxs arasında tərəflərin məsuliyyətini müəyyənləşdirən müqavilə bağlanır, göndəriş məktubunda bu müqavilə barədə qeyd edilir. Yenidənhazırlanma təhsilində ödəniş xərclərinin miqdarı Nazirliyin müvafiq struktur bölməsi ilə qabaqcadan razılaşdırılır və təlimati sənədlər əsasında müəyyənləşdirilir (11).

Yenidənhazırlanma təhsilinin təşkili mexanizmi bir qayda olaraq, sifariş və təklif əsasında həyata keçirilir. Sifarişlər birmənalı şəkildə "aşağıdan yuxarı" prinsipinə uyğun həyata keçirilir və iki formada olur: **dövlət sifarişi** və **fiziki şəxs tərəfindən verilən sifariş**.

**Dövlət sifarişi**. Yenidənhazırlanma təhsili üzrə dövlət sifarişi pedaqoji kadrın bir mütəxəssis kimi digər struktur bölmə, müəssisə, region və s. obyekt üçün zəruriliyi halı yarandıqda (kadr dislokasiyasındakı mütənasibliyə, yeni ixtisaslar üzrə kadr hazırlığına, istehsalat münasibətlərinin dəyişməsinə və s. uyğun) həmin subyektin işlədiyi müəssisə, təşkilat və orqan tərəfindən hazırlanır. Bu zaman yeni iş yerinin ixtisas xarakteristikası, subyektin ilkin baza təhsili və real potensial imkanları nəzərə alınır. Onun əvvəlki baza təhsili ilə yenidən alacağı ixtisas arasındakı yaxınlıq və fərqlər müəyyənləşdirilir. Bundan sonra həmin pedaqoji işçi ilə lazımi söhbətlər, fikir mübadiləsi, məsləhətləşmələr və s. aparılır, onun şəxsi arzusu və razılığı əsas götürülür, müvafiq təqdimat-sifariş hazırlanır. Təqdimatda yeni iş yerinin adı (ixtisas, fənn) onun üçün qoyulan tələblər, subyektin potensial imkanlarının həmin tələblərə uyğunluq səviyyəsi, yeni iş yeri üçün tələb olunan bilik və bacarıqların həcmi əsaslı şəkildə qeyd edilir, habelə mütəxəssisin yeni alacağı təhsilin keyfiyyəti, müddəti və nəticəsi ilə əlaqədar müqavilə şərtləri göstərilir. İxtisasartırma və yenidənhazırlanma tədris müəssisəsinin təkliflərinə reaksiya verilir. Yenidənhazırlanma təhsili verən müəssisənin (strukturun) təklifləri araşdırılır, real tələbatı ödəyə biləcək tədris proqramlarına müsbət reaksiya verilir, həmin müəssisə ilə əlaqə yaradılır, təhsil müddəti müəyyənləşdirilir, yenidən hazırlanacaq mütəxəssisəyə bu barədə məlumat təqdim edilir, planlaşdırma işi aparılır. Zəruri hallarda hələ mövcud olmayan, lakin real tələbata uyğun gələn yeni tədris proqramlarının hazırlanması üçün təkliflər verilir. Tərəflər arasında razılıq əldə edildiyi halda müvafiq müqavilə-kontrakt imzalanır. Bu rəsmi sənəddə təhsil xərcinin ödənilməsi, nəticənin keyfiyyəti və cərimə sanksiyalarının tətbiqi şərtləri mütləq qeyd olunur. Bundan sonra müdavimin müvafiq sənədlər, rəsmi göndəriş məktubu ilə birlikdə yenidənhazırlanma tədris müəssisəsinə göndərilir. Sənədləri müdavim özü şəxsən tədris müəssisəsinin müsahibə komissiyasına təqdim edir. Yalnız müsahibə komissiyasının müsbət qərarından və təhsil xərci ödənildikdən sonra müdavim yenidənhazırlanma təhsilinə qəbul olunur.

**Fiziki şəxs tərəfindən verilən sifariş.** Hər bir pedaqoji işçi və ya pedaqoji təhsili olan hər bir fiziki şəxs öz arzusu, təşəbbüsü (bir sıra hallarda işlədiyi müəssisədə əmək münasibətlərinin dəyişdiyinə görə) ilə də yenidənhazırlanma təhsilinə cəlb oluna bilər. Bu prosedura adətən yenidənhazırlanma tədris müəssisəsinin təklifləri ilə tanışlıqdan başlayır. Gələcək müdavim arzu etdiyi ixtisasa uyğun tədris proqramını seçir və tədris müəssisəsinə sifariş təqdim edir. Sifariş məktubunda ilkin baza təhsilini və almaq istədiyi ixtisasın göstərilməsi vacibdir. Cavab məktubunu alandan və müqavilə şərtləri ilə tanış olandan sonra şəxsi müqavilə bağlanır. Müqavilədə təhsil xərcinin miqdarı, onun kursun əvvəlində ödənilməsi, nəticənin keyfiyyəti və cərimə sanksiyalarının tətbiqi şərtləri qeyd olunur. Bundan sonra müdavim heç bir rəsmi idarə göndərişi olmadan müvafiq sənədlərini tədris müəssisəsinin müsahibə komissiyasına şəxsən təqdim edir. Yalnız müsahibə komissiyasının müsbət qərarından və təhsil xərci ödənildikdən sonra müdavim yenidənhazırlanma təhsilinə qəbul olunur. Öz arzususu ilə bu təhsilə qəbul olunanlara gələcəkdə müvafiq işlə təmin olunmaları üçün zəmanət verilmir. Yenidənhazırlanma təhsili üzrə təkliflər həm dövlət, həm də qeyri-dövlət müəssisələri tərəfindən verilə bilər. Har iki halda təklif olunan tədris proqramları müvafiq dövlət standartlar, çərçivəsində hazırlanmalıdır. Təklifləri dövlət təhsil müəssisələri müvafiq dövlət sifarişinə, fiziki şəxslər tərəfindən verilən sifarişlərə, müəssisənin öz təşəbbüsünə və ayrı-ayrı konsern, şirkət, assosiasiya və təşkilatların sifarişinə uyğun hazırlayır. Qeyri-dövlət müəssisələri isə öz təkliflərini şəxsi sifarişlərə, ayrı-ayrı konsern, şirkət, assosiasiya və təşkilatların sifarişlərinə, habelə müəssisənin öz təşəbbüsünə uyğun verir. Yenidənhazırlanma təhsil müəssisələri təklifləri tərtib edən zaman öz daxili imkanlarını (kafedra, şöbə, tədris-metodika kabinetləri, dekanlıq və s.) bir daha müəyyənləşdirir, təchizat məsələlərini araşdırır, tədris prosesinin yüksək səviyyədə təşkili üçün real şərait yaradır, öyrədənləri hazırlayır. Kursların tədris proqramlarının müasir tələblərə cavab verməsinə, onların informasiya təminatının yüksək səviyyədə olmasına, sifarişçilərin digər tələblərinin nəzərə alınmasına səy göstərir, müdavimlərin baza təhsili və alacaqları yeni ixtisas üzrə xüsusi differensasiya ilə hazırlanmış tədris proqramları arasındakı fərqin 1269 saatdan artıq olmamasına xüsusi diqqət yetirir. Yenidənhazırlanma kursları üçün tərtib edilmiş tədris proqramları ekspert və mütəxəssis rəylərinə təqdim olunur və yalnız bundan sonra müvafiq qaydada təsdiq edilərək sifarişçilərə çatdırılır. Təkliflər sifarişçilərə məktub, radio, televiziya, reklam, internet şəbəkəsi və s. vasitəsi ilə ötürülür. Təkliflərə müsbət reaksiya əldə edildiyi təqdirdə planlaşdırma işi aparılır, sifarişçilərlə əlaqə saxlanılır və müvafiq müqavilələr imzalanır. Müdavimlərin qəbulu ilə əlaqədar müsahibə komissiyası yaradılır. Komissiya təqdim olunmuş sənədlərin bu və ya digər ixtisas

uyğunluğunu yoxlayır və qəbul barədə qərar çıxarır. Yenidənhazırlanma kurs məşğələləri müasir təlim texnologiyasına uyğun aparılır, kursa qəbul və buraxılış zamanı fənnin xüsusiyyətindən asılı olaraq yazılı, şifahi açıq tipli suallardan, test sorğularından və s. geniş istifadə olunur.

Bu gün dünyada xalq təsərrüfatının müxtəlif sahələrində fəaliyyətin texnologiyalaşdırılması (alqoritmləşdirilməsi) təhsilin, intellektin və yeni biliklərin əldə edilməsinin əhəmiyyətini artırmaqdadır. Sosial, o cümlədən peşə və qeyri-peşə sahələrinin bir-biri ilə qarşılıqlı təsiri multikultural mühitin, yanaşmaların, baxışların, düşüncələrin, mədəniyyətlərin çoxcəhətliliyi və rəngarəngliyi cəmiyyətin, mühitin, elmin, şüurun, sosial rifahın, həyat şəraitinin dəyişmə sürətinin artması fonunda insan resurslarının və insan kapitalının əhəmiyyətini bir daha ortaya qoyur.

Əvvəlki dövrlərdə "kadr resurslarının inkişafı" dar mənada insanların təkmilləşməsi kimi şərh edilsə də, müasir dövrdə gələcək inkişaf üçün resurs kimi baxılır (Amartya, 1998: 734). Artıq müasir insan informasiya cəmiyyətinin bir parçası olmaqla onun tələblərinə cavab verə və yeni dövrün texnoloji yeniliklərinə uyğunlaşmaqla yanaşı, eyni zamanda gələcəyin daha mürəkkəb texnologiyalarını istifadə, idarə və yarada bilən hərtərəfli inkişaf etmiş şəxsiyyət modelini formalaşdırmaqdadır. Təsadüfi deyil ki, 1986-cı ildə Birləşmiş Millətlər Təşkilatının Baş Assambleyası tərəfindən qəbul edilmiş İnkişaf Hüququ haqqında Bəyannamədə **"insan kapitalı – inkişafın əsas mərkəzi subyektidir"** kimi nəzərdən keçirilmişdir (UNESCO World education report, 2000: 85). Belə inkişaf prosesinin özü birbaşa təhsillə bağlı olduğu üçün bu ümuminkişaf tendensiya fasiləsiz (ömürboyu) təhsilin əsas komponenti olan əlavə təhsilin və onun istiqamətlərinin də sosial sifarişə uyğun modernləşməsini tələb edir.

Öz növbəsində bazar iqtisadiyyatının və yeni iqtisadi münasibətlərin formalaşması, sürətli informasiyanın və yüksək texnologiyaların inkişafı ilə əlaqədar cəmiyyətin hər bir fərdi həm sosial, həm iqtisadi, eləcə də mədəni sahələrdə əsaslı dəyişikliklərin birbaşa iştirakçısına çevrilir. Yeni qlobal və meqa iqtisadi təsisatlar iş, bilik və bacarıqların yeni formalarını yaradır, təkmilləşdirir, tələb edir və qiymətləndirir. Bu halda yatırım maddi resurslara deyil, əmək ehtiyyatlarına və sosial kapitala qoyur.

Qeyd edilənlər Azərbaycanda fasiləsiz təhsil sistemində əlavə təhsilin rolununun artması onun əsas istiqamətləri və təşkili modelləri ilə şərtlənir.

## Ədəbiyyat

1. https://e-qanun.az/framework/1840
2. https://e-qanun.az/framework/5363
3. https://e-qanun.az/framework/767
4. Azərbaycan müəllimi. (2009). 13 noyabr. 2 s.
5. https://e-qanun.az/framework/41708
6. Bocharova, V. (1996). Strategiya i tekhnologiya obrazovaniya v oblasti sotsialnoy raboty.
7. https://edu.gov.az/az/esas-senedler/3050
8. Əliyeva, A. (2016). Azərbaycan Respublikasında pedoqoji kadrların əlavə təhsili: problemlər, perspektivlər. Bakı.
9. Azərbaycan müəllimi. (2010). 23 iyul, 3 s.
10. https://www.e-qanun.az/framework/46943
11. https://e-qanun.az/framework/20045
12. Amartya, S. (1998). Human Development and Financial Conservatism. World Development, Vol. 26, No. 4
13. World education report. (2000). The right to education: towards education for all throughout life. UNESCO: UNESCO Publishing, Printed in France, Paris.

Göndərildi: 17.07.2022 Qəbul edildi: 14.09.2022

QƏDİM DİYAR Beynəlxalq onlayn elmi jurnal. İmpakt Faktor: 0.652. 2022/ Cild: 4 Sayı: 9 / 26-32 ISSN: 2706-6185
ANCIENT LAND International online scientific journal. Impact Factor: 0.652. 2022 / Volume: 4 Issue: 9 / 26-32 e-ISSN: 2709-4197

DOI: https://doi.org/10.36719/2706-6185/15/26-32

**Günay Loğman qızı Ağayeva**
Milli Aviasiya Akademiyası
dissertant
gaghayeva@naa.edu.az

# TEXNİKİ UNİVERSİTETLƏRİN HAZIRLIQ FAKÜLTƏLƏRİNDƏ İNGİLİS DİLİNDƏ NİTQ BACARIQLARININ FORMALAŞDIRILMASININ LİNQVİSTİK ƏSASLARI

**Xülasə**

Bu məqalənin məqsədi texniki universitetlərin hazırlıq fakültələrində ingilis dilində nitq bacarıqlarının formalaşmasının linqvistik əsaslarını təhlil etməkdir. Son illərdə bəzi ali təhsil müəssilərində tələbələrə təhsilin ilk ilində yalnız ümumi ingilis dili və xüsusi məqsədlər üçün ingilis dili tədris olunur. Lakin, nəzərə almaq lazımdır ki, ingilis dilinin xüsusi məqsədlərlə təliminə böyük marağın olmasına baxmayaraq, ixtisası dil olmayan ali məktəblərdə ingilis dili təliminin burada təhsil alan tələbələrin ehtiyac və tələbatlarını nəzərə almaqla təşkil edilməsinin əhəmiyyəti və vacibliyinin lazımi dəyərləndirilməməsi müşahidə edilir. Xüsusilə, texnikiyönümlü ixtisaslarda ingilis dili fənninin tədrisinə xüsusi diqqət yetirilməlidir. Universitetlərin xarici dillər kafedraları ilə ixtisas kafedraları arasında fənlərarası koordinasiyanın olması, tədris ediləcək peşəyönümlü ingilis dili fənn proqramlarının ixtisas kafedralarının müəllimləri ilə birgə hazırlanması və tədrisin kommunikativ yanaşmaya əsaslanaraq təşkili tələbələrin əldə edəcəkləri peşəyə uyğun olaraq nitq bacarıqlarının formalaşdırılması, inkişaf etdirilməsi xidmət etməlidir.

***Açar sözlər:*** *ünsiyyət bacarıqları, diskurs, kompetensiya, linqvistik aspektlər, terminlər*

**Gunay Loghman Aghayeva**
National Aviation Academy
dissertatist
gaghayeva@naa.edu.az

## Linguistic basis of the formation of speaking skills in English in the preparatory faculties of technical universities

**Abstract**

The purpose of this article is to analyze the linguistic basis of forming speaking skills of learners in the process of English language learning at the preparatory faculties of technical universities. In recent years students are taught English for special purposes in addition to General English in the first year of study. However, the importance of teaching of English considering the learners' needs and requirements is observed to be insufficiently evaluated in universities that do not specialize in language. In particular, special attention should be paid to the teaching of English language in technical-oriented specialties. Interdisciplinary coordination between foreign language departments and speciality departments of universities, the preparation of subject programs together with teachers of speciality departments, and the applying the communicative labguage teaching approach should serve the formation and development of students' speaking skills.

***Keywords:*** *communication skills, discourse, competence, linguistic aspects, terms*

## Giriş

Dövrün tələbinə uyğun olaraq, qlobal ünsiyyət dilinə çevrilmiş ingilis dilinin kommunikativ məqsədlərlə, funksional şəkildə istifadə edilməsi, xarici dildə nitq bacarıqlarının formalaşması təhsil müəssisələrində xarici dil tədrisinin başlıca əsas məqsədinə çevrilmişdir. Bu məqsədlə artıq bəzi ali təhsil müəssisələrində tədris rus və Azərbaycan dilləri ilə yanaşı, ingilis dilində də aparılmağa başlamışdır. Lakin tələbələrin peşəyönümlü fənləri ingilis dilində tam mənimsəyə bilməməsi, dərslərdə fəal iştiraklarını təmin edə biləcək, fikirlərini aydın şəkildə ifadə edə biləcək qədər dil

biliklərinin və nitq bacarıqlarının olmamasını nəzərə alaraq bəzi ali təhsil müəssisələri hazırlıq fakültələri yaratmışdır.

Texniki universitetlərin hazırlıq fakültələrində ingilis dilinin tədrisinə lazımi qədər dərs saatı ayrılsa da tələbələrin nitq bacarıqlarının formalaşması problemi və tədrisin nəzərdə tutulan keyfiyyətdə olmaması prosesin linqvistik əsaslarını nəzərdən keçirtməyi şərtləndirir.

Qeyd etmək lazımdır ki, hazırlıq fakültələrində yalnız ümumi ingilis dili deyil, xüsusi məqsədlər üçün ingilis dili də tədris olunur. Tədris müddətində formalaşan nitq bacarığı auditoriya daxilində ünsiyyət vasitəsi olmaqla yanaşı, həmçinin tədris prosesinin uğurlu nəticəsininin göstəricisinə çevrilir. Lakin, xarici dildə danışıq öyrətmək bəzi müəllimlər üçün hələ də çətin olaraq qalır. Çünki bəzən müəllimlər üçün fənni tədris etmək yoxsa danışığı tədris etmək sualı meydana çıxır. Nitq bacarıqlarının formalaşdırılmasını çətinləşdirən amillərdən biri də onun eyni anda baş verən koqnitiv, fiziki, emosional və sosial-mədəni proseslərin vəhdəti olması və real ünsiyyətdə eyni zamanda baş verən bu proseslərdə dil öyrənənin bilik və bacarıqlarının aktivləşdirməsini təmin etməkdir.

Johson “Language Teaching and Skill Learning” kitabında nitq bacarıqlarını “müxtəlif şeyləri eyni anda etməyi özündə cəmləşdirən- kobinatorik bacarıq” adlandırıb (Johson,1966: 155).

Nitq bacarıqlarının formalaşması dildə kifayət qədər çox sözlər öyrənib, sadəcə qramamtik vərdişlərə yiyələnərək düzgün tələffüzlə cümlələr qurmaqdan ibarət deyil. Chomsky “The Logical Structure of Linguistic Theory” (1975) adlı tezisində qrammatik və struktur cəhətdən tamamilə düzgün lakin heç bir məna kəsb etməyən *“Colorless green ideas sleep furiously”* cümləsini quraraq danışmağın qeyd olunan bilik və bacarıqlardan daha artığını tələb etdiyini göstərir. İlkin tələb nitq bacarıqlarının formalaşdırılması zamanı şifahi nitqin səciyyəvi xüsusiyyətləri nəzərə alınmasıdır. Belə ki, nitq bacarıqlarına yiyələnərək xarici dildə (ingilis dilində) danışmağı öyrətmək dedikdə aşağıdakılar nəzərdə tutulur: (Chomsky, 1975: 10)

- İngilis dilindəki səsləri və səs nümunələrini öyrətmək;
- İngilis dilində heca və məntiqi vurğulardan (söz və cümlədə vurğu), intonasiya və ritmdən düzgün istifadə etməyi öyrətmək;
- Sosial mühitə, yaranmış situasiyalara və dinləyicilərə uyğun söz və cümlələrdən istifadə etməyi öyrətmək;
- İngilis dilində fikirlərini mənalı və məntiqli ardıcıllıqla ifadə etməyi öyrətmək; (Ismayilova, 2011: 212)
- İngilis dilində bir neçə təbii qısa fasilələrlə sürətli və səlis danışmağı öyrətmək*;* (Nunan, 2003: 55)
- İngilis dilində sual vermək, ünvanlanmış suala uyğun şəkildə cavab verməyi öyrətmək (Finocchiaro, 1974: 20).

Nitq bacarıqlarının formalaşması və nəticədə ingilis dilində səlis danışıq vərdişlərinə yiyələnmək, cümlə qurmaq üçün kifayət edəcək müəyyən bir qrammatik qayda, söz ehtiyatı və tələffüzdən başqa bir sıra başqa bacarıqlar da tələb edir. İngilis dilində danışmağı öyrənən tələbə artıq bu dili müxtəlif situasiyalarda- yolda birindən saatı soruşarkən, restoranda sifariş verərkən, yaxud tədbirlərdə akademik çıxışlar edərkən- istifadə etməyi öyrənir.

Başqaları ilə müxtəlif situasiyalarda, fərqli mühitlərdə necə ünsiyyət qurmağımızla, qarşılıqlı əlaqə qurarkən, fikir mübadiləsi aparakən dildən necə istifadə etməyimizlə əlaqəli olan bacarıqlara kommunikativ kompetensiya deyilir.

Kommunikativ kompetensiyalar şəxsi cəhətlərin və imkanların insanın kommunikativ fəaliyyətini təmin edən, eləcə də dil və dildənkənar bilik və bacarıqların məcmusudur.

Dilə praktik yiyələnmə olan kommunikativ kompetensiya aşağıdakı səciyyəvi cəhətləri özündə əks etdirir:

- yalnız məlumat xarakterli (deklarativ) deyil, həm də fəaliyyətin icrasına kömək edən, prosedur qaydaları əhatə edən prosessual xarakterli biliyi əhatə edir.
- kommunikativ kompetensiyanın bütün komponentləri bir-biri ilə bağlıdır;
- bir-bir ilə qarşılıqlı əlaqəsi olan bu komponentlər yalnız linqvistik mahiyyət daşımır, bura müxtəlif mətnlərin qurulması və oxunulan mətnlərin dərk edilməsi bacarığı, kommunikativ

məzmunun dəqiq mənimsənilməsi, fikrini başqalarının onu anlayacağı şəkildə düzgün və dəqiq formada ifadə edə bilməsi, nitq ünsiyyətinin məqsədinə nail olmaq və müxtəlif mədəni ənənələrə malik xalqların nümayəndələri ilə qarşılıqlı əlaqə qurmaq bacarığı daxildir.

Kommunikativ bacarıqlar və ya vərdişlərin formalaşması dedikdə, dilin linqvistik komponentlərinin mənanın ötürülməsində rolu, səmərəli ünsiyyət və davranışların formalaşmasında təsiri baxımından nitq fəaliyyətinin həm məna, həm də struktur baxımdan bağlılığı eyni dərəcədə əsas götürülür. Yəni, düzgün nitqin qurulmasında onun struktur-semantik bütövlüyü diqqət mərkəzində saxlanılır. İngilis dilində bəzən qrammatik qaydaların unudulması təklifinin nə qədər düzgün olmadığına o qədər də üstünlük vermək lazım deyil, səmərəli ünsiyyət məhz dilin qaydalarına tabe, düzgün, səlis və rabitəli nitqə malik olan şəkildə başqasına ötürülməsində gözləmək lazımdır. Kommunikasiyada qrammatik qaydalara hansı şəkildə tabe olmaqla bağlı onlar arasındakı bağlılığı nəzərə almaq lazımdır.

Nitq bacarıqlarının öyrədilməsi dedikdə nəzərdə tutulan müəyyən dəqiq qrammatik biliklərin öyrədilməsi yaxud tələbələrin sadəcə söz ehtiyatının artırılmasından daha çoxudur; xarici dildə danışmağı öyrətmək hədəf dildə sadəcə qrammatik vərdişlər yaradıb yeni sözləri müəyyən cümlələr daxilində istifadə etmək deyildir. Dərslərdə istifadə olunan müxtəlif nitq fəaliyyəti növləri tələblərdə nitq vərdişlərinin yaradılmasına xidmət edir amma nitq bacarıqları sadəcə nitq fəaliyyətləri vasitəsilə formalaşdırılmır.

Nitq bacarıqları formalaşdırarkən tələbənin dilə praktik olaraq yiyələnməsi (kommunikativ kompetensiya) müşahidə olunmalıdır. Tələbələr ünsiyyət zamanı təkrarlara yol verməməli, dialoqlarda növbəli danışığı tənzimləyə bilməli və eşidilən məlumata uyğun cavablar verməli, fikirlərini geniş və aydın şəkildə izah edə bilməlidir. Göründüyü kimi, qeyd olunan nəticənin əldə edilməsi üçün hər bir dil bacarığı (oxuma, yazma, dinləmə, danışma), qrammatika və lüğətin bir biri ilə əlaqəli şəkildə tədrisi zəruridir.

Danışığın bu xüsusiyyətlərinin çoxu diskursa - müxtəlif situasiyalarda çatdırılan fikrin təşkili və üslubuna aiddir. Z.Xerrisə görə diskurs verbal kommunikasiyada mətn, qrammatik formaların, bir-birinin dalınca sıralanmış frazaların ardıcıllığıdır. T.A.Van Deykə görə, diskurs "kommunikativ hadisədir". Diskurs dedikdə, subyektlərin və obyektlərin kimliklərini formalaşdıran mənalı praktikalar sistemlərini nəzərdə tuturuq (Foucault, 1972: 49).

Tələbələrin əvvəlcə gündəlik həyatda tez-tez rast gəlinən mövzular üzərində nitq bacarıqlarını formalaşdırılmasına çalışılmalı, daha sonra ixtisasyönümlü mövzularda bu bacarıqları daha da inkişaf etdirilməlidir. Nitq bacarıqları müəyyən qədər formalaşmış tələbələr artıq hər hansı bir problemi izah etməyə çalışarkən əgər lazımi sözü bilməsələr onu izah edərək qarşısındakına fikrini izah etməyə çalışır. Bu cür izahlardan (circumlocution) gündəlik həyatda da demək olar ki hərkəs istifadə edir. Hərhansı su sızması problemi zamanı ustaya borunun hissələrinin adını deyə bilməyən şəxs onun hansı hissə olduğunu izah etməyə çalışır. Uçuş zamanı təyyarə qanadındakı işlək mexanizmin adını bilməyən biri gördüklərini danışarkən həmin hissənin adını deyil funksiyasını və yerini deyərək qarşısındakına fikrini izah edir. Lakin texniki universitetlərin hazırlıq fakülətələrində dərs deyən müəllim bu situasiyalarda artıq tələb olunan terminlərin (elbow fitting, tee fitting, nozzle, flap, airleron, slat və s.) istifadə olunmasına diqqət yetirməlidir. Bunun üçün tədris proqramına uyğun materialı əvvəlcədən araşdırıb, istifadə ediləcəyi texmin edilən terminləri nitq fəaliyyətlərinin əvvəlində təqdim etməli, texniki terminlərin də istifadə olunduğu audio və video fayllardan istifadə etməlidir.

Hədəf dildə istifadə olunan leksik vahidlərin, söz və ifadələrin tezliyinə baxmayaraq məqsəd tələbələrin nitq bacarıqlarının formalaşdırılması, tələbələrin kommunikativliyinin artırılmasına nail olunmasıdır. Bu məqsədlə tədris prosesində əsasən kommunikativ yanaşma istifadə olunması məqsədəuyğundur.

*Brown* Teaching by Principles kitabında qeyd edir ki kommunikativ dil təlimi autentikliyə, interaktivliyə, tələbəyönümlü öyrənməyə, tapşırıq əlsaslı öyrənməyə, real situasiyalara əsaslanan ünsiyyətə və müəyyən məqsədlərə xidmət edən kommunikasiyaya əsaslan dil təlimidir (Brown, 2007: 378).

*Larsen-Freeman* isə kommunikativ dil təliminin tələbələrin dərs zamanı düzgün cümlələr qurmağı öyrənsə də dərsdənkənar real ünsiyyətdə öyrəndikləri dil biliklərindən istifadə edə bilməməsinə səbəb olan situativ dil təliminə (Oral Approach) qarşılıq olaraq meydana gəldiyini qeyd edir (Larsen-Freeman, 2000: 121).

Kommunikativ dil təliminin inkişafı, dərsdə düzgün cümlələr qura bilən, lakin sinifdən kənarda həqiqi ünsiyyət qurarkən onlardan lazımi şəkildə istifadə edə bilməyən tələbələri meydana gətirən Situasiyalı Dil Tədrisi (Şifahi dil təlimi) kimi metodların qəbul edilən uğursuzluğuna reaksiya idi (Larsen-Freeman, 2000: 121).

1960-cı illərdə xüsusilə müharibə sonrası dövrdə xarici dildən istifadə edərkən daha çox dialoqlar qurmaq və real ünsiyyətdə olmaq ehtiyacı kommunikativ təlimin məhz həmin periodda meydana gəlib, inkişaf etdirilməsinə səbəb olsa da, metodistlər bu yanaşmaya müəyyən bir tərif verə bilməmişdirlər. Bu problemi nəzər alan Ellis qeyd edir ki, kommunikativ dil təlimi özündə müxtəlif fərqli yanaşmaları ehtiva edən dil təlimidir. Və onun məqsədi qrammatik, sosialinqvistik, diskurs və strateji kompetensiyaların vəhdəti hesab edilən kommunikativ komptenesiyanı inkişaf edirməkdir (Ellis, 1982: 73-81).

*Richards və Rodgers* də kommunikativ dil təliminin dilə kommunikativ yanaşmanı əks etdirən müxtəlif prinsiplər toplusuna aid olduğunu iddia edirlər və buna görə də kommunikativ dil təliminin ən uyğun tərifini bu yanaşmanın tətbiq edildiyi tədris zamanı əldə olunan təcrübələr, onların xüsusiyyətləri və prinsiplərini təhlil etməkdən əldə edilə biləcəyini qeyd edirlər (Richards, Rodgers, 2001: 161).

*Roche* qeyd edir ki, kommunikativ dil təlimi göstərdi ki dil öyrənənlər "doldurulması lazım olan boş bir qab" deyil, öz fikirlərini və ehtiyaclarını ifadə edə bilən və istiqamətləndirilə bilən fərdlərdir (Roche, 2005: 25).

Dil tədrisində hədəf dildə inkişaf etdirilməsi nəzərdə tutulan bacarıqlar, audio-lingual metoddan fərqli olaraq, öyrənənlərin xarici dildə səhvsiz və mükəmməl strukturlar qurmasına deyil, onların mənalı cümlələr qurmağa, məzmunu başa düşməyə və dildən lazımi məzmunlarda istifadə etmək bacarığını inkişaf etdirməyə xidmət edir. Buna görə də dəqiqlikdən çox səlislik ön plana çıxıb və ümumi məqsəd tələbələrin yaradıcı olması və ifadə etmək istədikləri fikri çatdırmasıdır. *Richard və Rodgers* xüsusilə qeyd edir ki, xarici dildə tədrisin əsas məqsədi ünsiyyət qura bilməkdir (Nunan, 2003: 25; Richards, Rodgers, 2001: 172).

*Litllewood* da həmçinin audio-lingual metodla kommunikativ yanaşmanı müqayisə edərək qeyd edib ki, bu yanaşma audio-linqvual metoddan fərqli olaraq, dil tədrisinin məqsədi xarici dildə ünsiyyət qura bilmək bacarıqlarını formalaşmasını əsaslanır və təlimdə dil öyrənənlərin sərbəst fəaliyyətinə xidmət edir. Təlim zamanı bu sərbəst fəaliyyəti təmin etmək üçün, tələbələrin danışarkən etdikləri səhvləri nitqləri kəsilərək düzəldilməməli, onlara danışaraq dili nə dərəcdə bildiklərini müşahidə etmə imkanı verilməli, səlis və düzgün nitqi təcrübə edərək öyrənmə şansı yaradılmalıdır (Hinkel, 2011: 635-636).

Kommunikativ dil tədrisi sahəsində mütəxəssis *Margie S. Bern* yazır ki, dil qarşılıqlı əlaqədir; bu, şəxsiyyətlərarası fəaliyyətdir və təbii olaraq mövcud cəmiyyətlə sıx əlaqəyə malikdir. Dil öyrənənlərin motivasiyası cəmiyyətdə, ətraflarında olan mövzularla bağlı mənalı ünsiyyət qurmaq istəyindən irəli gəlir. Bu baxımdan, dil tədqiq edilərkən onun istifadəsinə həm sosial kontekstdə, həm də linqvistik kontekstində baxılmalıdır (Sandra, Savignon, Margie, Berns, 1984: 76).

Xomskinin ilk dəfə "kompetensiya" anlayışını istifadə etdikdən və daha sonra Hymesin "linqvistik kompetensiya" ilə bağlı apardığı araşdırmalarından sonra "kommunikativ kompetensiya" anlayışı bu ifadələrin yerini tutmuşdur.

Hələ 1974-cü ildə *Piefo* dilin özünü deyil, onun istifadəsini və məzmununu təhsil sistemlərindən və tədris fromasından asılı olmayaraq öyrənməyi hədəfləyən bir təklif irəli sürdü (Legutke, Schocker-v, Ditfurth, 2003: 1-40).

Kommunikativ kompetensiya həm insanın mənimsədiyi danışıq qaydaları haqqında bilikləri, həm də dildən istifadə etmək bacarığını təsvir edir. Bu anlayışa koqnitiv, emosional və funksional amillər daxildir. Eyni zamanda, kommunikativ kompetensiya ünsiyyəti "kontekstə uyğun danışıq" kimi təsvir edir (Zimmermann, 1984: 99-100). Hymesa (1972) görə, "natiq danışarkən öz biliyini 4

növ linqvistik parametrdə praktikada tətbiq edir. Bu parametrlər; O, linqvistik strukturlaşdırılmış, mövcud maddəyə uyğun, verilən mövzu üçün meyar kimi uyğun və praktikada adət-ənənələrə uyğun olmalıdır.

Dilçi alim Habermas kommunikativ səriştəni fərqli şərh edərək qeyd etmişdir ki, kommunikativ qabiliyyəti olan insan "fəlsəfi diskurslarda iştirak etmək iqtidarındadır, əgər o, belə bir danışıqda iştirak etmək istəsə, müxtəlif nitq situasiyalarına və nitq vəziyyətinə uyğun olan diskursu əvvəlcədən müəyyən edə bilər" (Zimmermann, 1984: 102).

*Barsuk, Baqariç və D.Yunusov, Moçida, Moss və Donna Hatçinson və Vaterin* fikirlərinə görə müasir dövrdə kommunikativ yanaşmanın elmi-nəzəri əsasları müxtəlif təhsil paradqmaları və ənənələri özündə birləşdirir; buraya əsasən ingilis dilinin ikinci dil kimi qazanılması tədqiqatların öyrənilməsi, kommunikasiyanın əməkdaşlıq şəraitində tədrisi, səriştə (kompetensiya) və məzmun əsaslı təlim prosesinin yaradılması kimi izah olunur.

Kommunikativ yanaşmanın tərəfdarı olan metodistlər lüğət və qrammatikanı ayrılıqda vahidlər kimi öyrətmək əvəzinə dilin səlisliyinə diqqət yetirirlər, bu, əsasən qrammatika və əzbərləmə qaydalarına diqqət yetirmək əvəzinə mənalı fikir yürütməni və ünsiyyətin əhəmiyyətini vurğulayan Krahsenin təsiri altında olan dəyişiklikdir. Terrell ilə həmfikir olan Krashen, təbii yanaşmanı irəli sürərək qeyd edir ki, dil öyrənmənin əsas prinsipi dil mühiti yaratmaqdır; dərs auditoriyasında təbii dil mühiti yaradıldıqda xarici dilin mənimsənilməsi də ana dili öyrənmək kimi baş verə bilər. Kraşen dil öyrənməni və dili mənimsəməkdən fərqləndirir. Onun fikrincə, qaydalar və formalar dil öyrənmə zamanı öyrənilir, mənimsəmədə isə öyrənmədən fərqli olaraq öyrənənlər hədəf dildə təbii mühitdə olduqlarından dili təbii şəkildə mənimsəyirlər. Eynilə, orjinal mətnlərin istifadəsi CLT sinif otaqlarında vacibdir və Larsen-Freeman və Anderson (2011) görə orjinal material CLT-nin mühüm aspekti olan sinifdə real ünsiyyət üçün mühit təmin edir. Orjinal mətnlərin istifadəsi kommunikativ dilin öyrədilməsinin və qaydaların öyrənilməsinin əsas kommunikativ məqsədini ən yaxşı şəkildə yerinə yetirə bilər; ünsiyyət və müzakirə nəticəsində yaranan strukturların yadda saxlanması dilin tədricən mənimsənilməsi ilə nəticələnir və bu orjinal mətnlərdən istifadə etməklə dilin formasını və linqvistik aspektlərini də diqqət mərkəzində saxlayaraq həyata keçirilir. Buna görə də asanlıqla demək olar ki, xarici dil öyrənənlərin kommunikativ səriştəsini inkişaf etdirmək üçün başqaları ilə ünsiyyət və qarşılıqlı əlaqə CLT-nin əsas məqsədidir (Lightbown, Spada, 2006: 66; Larsen-Freeman, Anderson, 2011: 9-10).

Beləliklə, ingilis dilində kommunikasiya, eyni zamanda fikir mübadiləsi şəraitində, real ünsiyyət mühitində daha yaradıcı şəkildə formalaşır. Və tələbələrin nitq bacarıqları nitq fəaliyyətinin əsas komponentləri hesab olunan nitqin axıcılığı, düzgünlüyü və haqqında danışılan mövzuya uyğunluğu nəzərə alınaraq formalaşır.

Dilçi alimlərin tədqiqatlarına və fikirlərinə istinad edərək qeyd etmək olar ki, ingilis dilində *düzgün, axıcı və rabitəli* nitq sosial bir öhdəlik kimi, həyatımızın bir hissəsinə çevrilmişdir. Həmçinin, tədqiqatçılar ingilis dilinin kommunikativ şəraitdə tədrisinin onun müxtəlif situasiyalarda öyrədilməsini nəzərə alaraq, kommunikasiyanın növlərinin bir-birindən fərqləndiyini qeyd edirlər.

Kommunikasiya dedikdə tələbələrin qrammatik qaydalar, düzgün cümlə strukturları nəzərə alınaraq, baş verən situasiyaya uyğun, rabitəli və axıcı nitqi ilə müşahidə olunan danışıq dili nəzərdə tutulur. Burada lüğət, dilin quruluşu və tələffüz qaydalarının düzgün işlənməsi tələb olunur, tələbələrin nitqinin formalaşmasında diqqət təkcə fikirlərini ifadə edə bilmələrinə yox, həmçinin qaydalara uyğun danışmağa yönəldilir.

Dəqiq və axıcı, səlis nitqin formalaşması üçün tələblərə dərs prosesində daha çox sual-cavablardan və lüğət əsaslı yaxud qrammatik qaydalara əsaslanan tapşırıqlardan istifadə edilir. Bu komponentlərin nəzərə alınması çox zaman balanslı şəkildə olmur və əksər hallarda əsas diqqət ya sadəcə linqvistik qaydaların düzgün tətbiq olunmasına yaxud sadəcə lüğətdən düzgün istifadə olunmasına yönəldilir. İlk halda, ünsiyyət zamanı tapşırığın formasından asılı olaraq yalnız qrammatik səhvlər qeyd olunur, nitq fəaliyyəti yalnız söz sırasının düzgün qurulması, cümlələrin qrammatik cəhətdən dəqiq işlənməsi kimi komponentlər qiymətləndirilir. İkinci halda isə kontekstə uyğun müvafiq yeni sözlərdən düzgün istifadəyə önəm verildiyindən ünsiyyət zamanı dilin

dəqiqliyi pozulsa da bu səhvlər aradan qaldırılmır. Dilin bu şəkildə öyrənilməsi və qiymətləndirilməsi şagirdlərdə təfəkkürü az formalaşdırır, ünsiyyətdə məsafə yaradır və nitq vərdişləri ləng inkişaf edir. Burada əsas diqqət mənalı ünsiyyətə, qarşılıqlı əks-əlaqəyə və yeni kompetensiyalara yiyələnməsini təklif edir, ilk öncə, nitq fəaliyyətinin komponentlərini müəyyən etmək onların hansı fəaliyyətlərdə iştirakını, ünsiyyət zamanı hansı tapşırıqlara müraciət etməsini təmin edir və eyni zamanda bu komponentləri düzgün qiymətləndirməsini tələb edir.

*Savçenko, Şubina, Litlvud, Reid* qeyd edirlər ki, aydın nitq, asan əks-əlaqənin qurulması və məzmunun anlaşılması üçün əsas strategiya axıcı, rabitəli kommunikasiyanın qurulmasıdır. Yəni, axıcı nitq istənilən situasiya zamanı məqsəd və mənanı axıcı şəkildə asanlıqla ötürür, verbal və qeyri verbal hərəkətlərin köməyi ilə nitqini asanlıqla qurur və əlverişli ünsiyyətə daxil olur. Effektiv ünsiyyətin tələblərinə nitq fəaliyyətinin qaydalara uyğunluğu-yəni, nəzakətli davranış qaydaları, növbəli ünsiyyət, müraciət olunana uyğun düzgün xitablardan və müraciət formalarından istifadə olunması, təklif və məsləhətlərdə aydın ifadə tərzini qurmaq, dəvətlər, razılıq və narazılıqların ifadə olunması və s. daxildir. Fikirləri ümumiləşdirərək qeyd olunur ki, dil öyrənənlərdə axıcı və rabitəli nitq bacarıqlarının formalaşdırılması üçün dilin təbii şəkildə mənimsənilməsi, kommunikativ strategiyaların tətbiq olunması, dilin müəyyən kontekstlər daxilində öyrədilməsi nəzərdə tutulur və dil öyrənənlər arasında hədəf dildə kommunikasiyaya nail olunmaq əsas məqsəd kimi qeyd olunur.

Təqdim olunan bu nəzəri fikirlər kommunikasiyanın hərtərəfli formalaşmasına zəmin yaratmır, belə ki, kommunikasiya zamanı linqvistik qaydaların işlənməsinə diqqətin daha çox yönəlməsi və ayrıca tədris olunması kommunikativ bacarıqların foralaşmasında dinamikliyi pozur. *Litlvud, Şubina Savçenkonun* fikirləri dilin səlis və rabitəli işlənməsini daha düzgün açıqlayır, tədqiqat işinin müddəalarına uyğun dilin yalnız təbii formada, mənalı kommunikasiyada işlənməsini təklif edir.

## Nəticə

Nəticə olaraq, xarici dilin tədrisində kommunikativ bacarıqların formalaşması üzrə təqdim olunmuş araşdırmalar və mülahizələrdən belə qənaətə gəlmək olar ki, ingilis dilinin ənənəvi təlim metodundan birbaşa kommunikativ əsaslı təlim metodu ilə tədrisi bu ölkələrin inkişafında köklü dəyişikliklər etmişdir. Bu dildə kommunikativ bacarıqların formalaşmasının müxtəlif nəzəri aspektləri onun müxtəlif kontekstlərdə işlənməsinin əhəmiyyətini izah edir. Belə ki, bəzi nəzəriyyəçilər kommunikativ bacarıqların qazanılmasında linqvistik qaydaların öyrənilməsini, bəziləri bu qaydalara əsaslanaraq, onun dildə işlənməsini, digərləri isə kommunikasiyanın sosial bir bacarıq olaraq mədəniyyətlərin öyrənilməsinə, davranış normalarına riayət edərək müxtəlif məqsədlərə xidmət etdiyini xatırladır. Məqalədə şərh olunan bütün fikirləri ümumiləşdirərək, belə bir nəticəyə gəlmək olar ki, Krashen və Litlvud nəzəri müddəaları müasir ingilis dilinin metodologiyasının, kommunikativ təlimdə tədrisinin linqvistik əsaslarını tam açıqlamış, məhz xarici dil öyrənənlərin nitq bacarıqlarının formalaşdırılmasının, sosial və funksional bacarıqlarının inkişaf etdirilməsinin nəzəri aspektlərini əhatəli şəkildə təsvir etmişdir.

## Ədəbiyyat

1. Johson, K. (1966). “Language Teaching and Skill Learning”. Oxford: Blackwell Publishers, 155 p.
2. Chomsky. (1975). The Logical Structure of Linguistic Theory. New-York: Springer Publishing, 10 p.
3. Ismayilova, D. (2011). Teaching English as a Foreign Language. Mutarcim, 212 p.
4. Nunan, D. (2003). Practical English Language Teaching. McGraw-Hill, 55 p.
5. Finocchiaro, M. (1974). English as a Second Language: From Theory To Practice, New York: Regents Pub. Co., 20 p.
6. Foucault, M. (1972). The Archaeology of Knowledge. London, Tavistock, 49 p.
7. Brown, H., Teaching by Principles (2007), New York: Addison Wesley Longman Inc. p.378.
8. Larsen-Freeman, D. (2000). Techniques and principles in language teaching 2nd ed. New York: Oxford, 121 p.

9. Ellis, R. (1982). Informal and formal approaches to communicative language teaching. ELT journal, p.73-81.
10. Richards, J., Rodgers, T. (2001). Approaches and methods in language teaching 2nd ed. New York: Cambridge, p.161-172.
11. Roche, J. (2005). Fremdsprachenerwerb Fremdsprachendidaktik. Narr Francke Attempto Verlag, Tubingen, p.25.
12. Hinkel, E. (2011). Handbook of research in second language teaching and learning. Routledge, p.635-636.
13. Sandra, J. Savignon and Margie, S. Berns. (1984). Initiatives in Communicative Language Teaching, Pearson College, 76 p.
14. Legutke, M., Schocker-v. Ditfurth, M. (2003). Kommunikativer Fremdsprachenunterricht: Rückblick nach vorn, "KommunikativerFremdsprachenunterricht: Bilanz und Perspektiven. Eine Einführung", Tubingen, p.1-40.
15. Zimmermann, R. (1984). Pragmalinguistik und kommunikativer Fremdsprachenunterricht: am Beispiel d. engl. Anfangsunterrichts, Julius Groos Verlag, Heidelberg. p.99-100, p.102.
16. Lightbown, P., Spada, N. (2006). How Languages Are Learned, 3rd ed. Oxford: Oxford University, 66 p.
17. Larsen-Freeman, D., Anderson, M. (2011). Techniques & Principles in Language Teaching (3rd ed.). New York: Oxford University Press, p.9-10.

Göndərildi: 29.06.2022 Qəbul edildi: 08.09.2022

DOI: https://doi.org/10.36719/2706-6185/15/33-37

**Araz Fazil oğlu Qasımov**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
magistrant
araz.qasimov97@mail.ru

# TURİZMİN İNKİŞAFINDA RƏQƏMSAL XİDMƏTLƏR

**Xülasə**

Turizm sektorunda əməyin rəqəmsal transformasiyası prosesi kifayət qədər dinamikdir. Buna baxmayaraq, bütün turizm müəssisələri dəyişikliklərə və yeni texnologiyaların tətbiqinə eyni dərəcədə hazır deyil. Məhz buna görə də turizm sektorunda əməyin transformasiyası üçün müsbət və mənfi ehtimallar proqnozlaşdırılır. Bundan başqa, turizm sektorunda robotların tətbiqi nəticəsində əməyin səmərəliliyini artıran, xərcləri azaldan, o cümlədən rəqəmsal bacarıqlara, yaradıcılığa və digər peşəkar xüsusiyyətlərə malik real işçilərin əhəmiyyətini artıran rəqəmsal texnologiyaların təkmilləşdirilməsinə xüsusi diqqət ayrılır.

Xidmətlərin rəqəmsal transformasiyası prosesi inkişaf etmiş regionlarda turizm sektorunda çalışan işçilərin karyera yüksəlişinə töhfə verməklə yanaşı, inkişaf etməkdə olan regionlardakı işçilərə peşədə özlərini ifadə etmək imkanı yaradır. Rəqəmsallaşdırma prosesləri və qeyri-adi turizm məhsullarının (məsələn, virtual reallıq) yaradılması ideyaları bütün dünyada turistlərin marağını artırmaq üçün turizm müəssisələrinin prioritetlərindən birinə çevrilmişdir.Xidmətlərin rəqəmsal transformasiyası proseslərinin mürəkkəbliyinə və qeyri-müəyyənliyinə baxmayaraq, turizm və mehmanxana müəssisələrinin işçilərinə, habelə turizmin və bütövlükdə otel biznesinin inkişafına müsbət təsir edəcək perspektivlər və real imkanlar müəyyən edir.

***Açar sözlər:*** *rəqəmsal, Azərbaycan, texnologiya, müasir, transformasiya, turizm*

**Araz Fazil Gasimov**
Azerbaijan State University of Culture and Arts
master student
araz.qasimov97@mail.ru

## Digital services in the development of tourism

**Abstract**

The process of digital transformation of labor in the tourism sector is quite dynamic. Nevertheless, not all tourism enterprises are equally ready for changes and the introduction of new technologies. That is why positive and negative possibilities are predicted for the transformation of labor in the tourism sector. In addition, as a result of the introduction of robots in the tourism sector, special attention is paid to the improvement of digital technologies that increase labor efficiency, reduce costs, as well as increase the importance of real workers with digital skills, creativity and other professional characteristics.

The process of digital transformation of services contributes to the career advancement of workers in the tourism sector in developed regions, and provides an opportunity for workers in developing regions to express themselves in the profession. Digitalization processes and the ideas of creating unusual tourism products (for example, virtual reality) have become one of the priorities of tourism enterprises to increase the interest of tourists around the world. Despite the complexity and uncertainty of the processes of digital transformation of services, it identifies prospects and real opportunities that will positively affect the employees of tourism and hotel enterprises, as well as the development of tourism and the hotel business as a whole.

***Keywords:*** *digital, Azerbaijan, technology, modern, transformation, tourism*

## Giriş

Rəqəmsal xidmətlər turizm xidmətlərinə və otel biznesinə inteqrasiya edib. Lakin təəssüf ki, iqtisadiyyatın turizm sektorunun subyektləri turizmdə baş verən yeni texnologiyalar və əsaslı dəyişiklikləri heç də həmişə qəbul etməyə hazır deyillər. Turizm və mehmanxana xidmətləri bu sahədə çalışan işçilərin işinin keyfiyyətindən çox asılı olduğundan, xidmətin rəqəmsal transformasiyası turizm bazarında ciddi nəticələrə gətirib çıxaracaq. Xidmətin rəqəmsal transformasiyası xidmətin təşkilinə, xidmət prosesinin mərhələlərinə, işçinin funksiyalarına, habelə bütövlükdə xidmət münasibətləri sisteminə yanaşmanın dəyişdirilməsini nəzərdə tutur (Bilalov, 2006: 278).

Məsələn, turizm və qonaqpərvərlik sənayesində rəqəmsal idarə olunan xidmət bazarına ağıllı, iddialı, məsuliyyətli, təlim keçə bilən, bacarıqlı və yaradıcı işçilər lazımdır. Turizmdə rəqəmsallaşmanın geniş vüsət alması ona gətirib çıxaracaq ki, gələcəkdə turizm agenti, məsləhətçi, mühasib və s. kimi peşələrə ehtiyac qalmayacaq. Bununla belə, robotlar yaradıcılıq, ixtira, dizayn, proqramlaşdırma və özlərinə qulluq, istehsalın təşkili və tənzimlənməsini əvəz edə bilməyəcəklər. Bundan başqa, süni intellektə müxtəlif əxlaqi və mədəni normaları nəzərə alaraq etik qərarlar qəbul etmək hələ də öyrədilmir. Buna görə də, turizm təşkilatlarının axtaracağı yeni şərtlərə və vəzifələrə tez uyğunlaşmağı bacaran məhz yaradıcı və ixtiraçı işçilərdir (Bilalov, Gülalıyev, 2015: 492).

Xidmətin rəqəmsal transformasiyasının inkişafının növbəti istiqaməti turizm və mehmanxana biznesində işçilərin işinin keyfiyyətinə təsir göstərir. Xidmətin rəqəmsal transformasiyası dövründə bir işçinin asanlıqla öyrənə, yeni texnologiyalara və iş şəraitinə uyğunlaşa biləcəyi çevik bacarıqları yüksək qiymətləndirilir. Bundan əlavə, rəqəmsal texnologiyaların meydana çıxması ilə əmək bazarında rəqabət qabiliyyətini artırmaq, eləcə də təşkilat daxilində karyera qurmaq üçün işçilər daim öyrənməli, yeni bilik və bacarıqlar əldə etməli, bunların yaranmasına nəzarət etməlidirlər. Beləliklə, "Həyat boyu öyrənmə" konsepsiyası turizm və qonaqpərvərlik işçiləri arasında getdikcə daha çox populyarlıq qazanacaq ki, bu da işçiləri fəaliyyət sahələrinə uyğun olaraq yeni bacarıqlara yiyələnməyə sövq edəcək (Əliyev, 2004).

İndi də işçilərin karyera yüksəlişi üçün daimi təlimə ehtiyac olduğunu başa düşməsi internetdə müxtəlif təlimlərin və onlayn məktəblərin (məsələn, turizm sahəsində - Hilton Universiteti) meydana çıxmasına təsir göstərmişdir. Kompüter və informasiya texnologiyalarının əsasları, yeni biznes meylləri üzrə biliklər və şəxsi keyfiyyətləri inkişaf etdirmək lazım gəlir. Bununla yanaşı, xidmətin rəqəmsal transformasiyası turizm və qonaqpərvərlik işçilərindən "rəqəmsal bacarıqlar" adlanan bacarıqları və ya yeni texnologiyalara uyğunlaşma, onlarla işləmək bacarığını təkmilləşdirməyi tələb edəcək. Bu bacarıqları ümumiləşdirmək və izah etmək üçün Kanada tədqiqatçıları rəqəmsal bacarıqların bir neçə kateqoriyanı əhatə etdiyi təsnifat müəyyən etmişlər (Azerbaijan (guide), 2003):

− əsas savadlılıq, yazı, sənədlərdən istifadə və hesablama bacarıqlarını özündə əks etdirən fundamental bacarıqlar və işlərin uğurla yerinə yetirilməsi.

− komanda işi, ömür boyu öyrənmə, problemlərin həlli və əlaqələrin inkişafı kimi əsasən ötürülə bilən, çevik bacarıqları özündə birləşdirən bacarıqlar (Bu "çevik" bacarıqlar olmadan işçinin texniki potensialı tam reallaşdırıla bilməz).

− rəqəmsal texniki bacarıqlar kompüter və proqram təminatının istifadəsi, şəbəkə təhlükəsizliyinin tətbiqi və s.

Rəqəmsal məlumatları emal bacarıqları günümüzün rəqəmsal iş yerlərinin effektiv işləməsi üçün çox vacibdir. Bunlar informasiyanın axtarışı, sintezi, qiymətləndirilməsi, tətbiqi, yaradılması və ötürülməsi kimi informasiyanın emalı ilə bağlı yüksək səviyyəli koqnitiv (dərkediləbilən) bacarıqlardır. Buraya, digər şeylərlə yanaşı, informasiya və kompüter texnologiyaları sahəsində xüsusi ixtisas və peşələr əldə etmək üçün zəruri olan qabiliyyətlər daxildir (Azar, 1973).

Eyni zamanda, turizmdə robot avadanlıqların onlayn idarə edilməsi texnologiyaları hazırlanacaq ki, bu da ilkin mərhələdə çoxlu sayda onlayn operator tələb edəcək. Bundan başqa, gələcəkdə rəqəmsal texnologiyalar əlilliyi olan işçilərin xidmət bazarına daha yaxşı inteqrasiyasına imkan verəcək və onları uyğun və təhlükəsiz vakansiyalarla təmin edəcək. Bütün təhlükəli və sadə rutin işləri robotlar görəcək. İnsanlar asudə vaxtlarını başqa iş, istirahət, yaradıcılıq və s. üçün daha differensial şəkildə istifadə edə biləcəklər (Azerbaijan (guide), 2003).

Gələcəyin turizm dektorunda işçi daha geniş bilik və bacarıqlara yiyələnməli olacaq. Beləliklə, turizm təşkilatları, məsələn, rəqəmsal texnologiyalardan istifadə edərək həm istehsal, həm də iqtisadi

proseslərə nəzarət edə biləcək. Bir ixtisaslı mütəxəssisdən istifadə edərək maliyyə resurslarını optimallaşdıra biləcəklər.

Rəqəmsal texnologiyalar xidmət bazarında yerli tələbat az olan regionlardakı mütəxəssislər üçün məşğulluq imkanları açacaq ki, onlar nəinki distant işləməyə, həm də zərurət yarandıqda öz bacarıqlarını artıra və ya yeni peşə öyrənə biləcəklər. Sonradan turizmdə rəqəmsal texnologiyalar ona gətirib çıxaracaq ki (Kirillova, 2015: 89-98):

- uzaqdan işləməyə görə informasiya fəaliyyətindən periferiya işçilərinin əməkhaqqında artım olacaq, eləcə də məşğulluğun artacaq, çünki iqtisadi mərkəzdən uzaqlıq artıq işə olan tələbatı məhdudlaşdırmayacaq;

-mərkəzdə yaşayan işçilərlə periferiyadakı işçilər arasında əmək haqqı fərqində azalma olacaq, çünki periferiyadakı işçilər xidmət təklifinin aşağı qiyməti səbəbindən daha rəqabətə davamlı olacaqlar;

– yeni rəqəmsal texnologiyalar sayəsində idarəetmə personalı ilə tabeliyində olanlar arasında qarşılıqlı əlaqənin effektivliyi onların arasındakı fiziki məsafədən daha az asılı olacaq.

Sonradan əmək resurslarına, icarə haqqına və s. qənaət məqsədilə biznes proseslərinin bir hissəsinin mərkəzdən periferiyaya köçürüləcəyi proqnozlaşdırılır ki, bu da təbii ki, yerli əmək bazarlarına müsbət təsir göstərəcək (Golovenchik, 2018: 27-43).

Bütün müsbət perspektiv proqnozlara baxmayaraq, turizm və qonaqpərvərlik sənayesində xidmət prosesinin rəqəmsal transformasiyasının mənfi də tərəfləri var. Əşyaların interneti texnologiyaları, süni intellekt və digər rəqəmsal texnologiyalardan fəal şəkildə istifadə olunacağından, turizm məhsulunun dəyərini minimuma endirəcək şəkildə iş yerlərinin azalması qaçılmaz olacaq.

Digər bir mənfi cəhət 2030-cu ilə qədər, ümumilikdə, işçi qüvvəsi kəmiyyətcə azalacaq, daha yaşlı, daha formal təhsilli olacaq, əlavə olaraq, peşələrin 50%-nin sıradan çıxması tendensiyası müşahidə olunacaq.

Həmçinin, rəqəmsallaşma prosesi milli mədəniyyətlərin dəyişməsinə gətirib çıxarmaq təhlükəsi yaradır. Onsuz da insanların dünyagörüşünün və təfəkkürünün dar ixtisaslaşma çərçivəsində son dərəcə məhdud olduğu ölkələrdə münasibətlərdə insanlığı standartlar və normalar əvəz edib (Əlirzayev, 2005: 537).

Həmçinin rəqəmsal texnologiyaların tətbiqi zamanı təhlükəsizliyə xüsusi diqqət yetirilməlidir. Ölkədə və ya ayrı-ayrı təşkilatlardada rəqəmsal nizam yaratmazdan əvvəl təhlükəsizlik sistemini təkmilləşdirmək lazımdır. Bu, birbaşa turizm və mehmanxana biznesi sahəsinə aiddir, çünki xidmətin rəqəmsal transformasiyası müştərilərin şəxsi məlumatlarının kompüter proqramlarında və digər texnologiyalarda aktiv istifadəsinə səbəb olacaqdır. Bu edilmədikdə, rəqəmsal transformasiyanın nəticələri ciddi problemlərə səbəb ola bilər. Məsələn, məlumat sızması, kiberhücumlar və robotların və maşınların viruslarla, məsələn, troyanlarla yoluxması və s.

Yuxarıda qeyd edildiyi kimi, kompüter və informasiya texnologiyaları ilə yanaşı, rəqəmsallaşdırma kimi proses – xidmətin xüsusi proqramlaşdırılmış maşın və robotlarla əvəzlənməsi geniş vüsət alır (Əlirzayev, 2006: 512).

Turizmdə rəqəmsallaşdırma ən dinamik şəkildə inkişaf edir. Bu proses turizm təşkilatlarına xidmət və turizm məhsullarının istehsalı ilə bağlı xərcləri azaltmağa imkan verəcək. Bu gün robotların bəzi insan vəzifələrini öz üzərinə götürdüyü yerlər artıq var. Məsələn, Yaponiyanın "Henn-na" oteli qonaqları qəbul masasında qarşılayan və əşyaların qablaşdırılmasına kömək edən robotu ilə məşhurdur

Turizm və mehmanxana xidmətləri sahəsində rəqəmsallaşdırma öz mənfi təsirini göstərir. Bu sahədə iş yerlərinin ixtisarı 70%-ə çata bilər. Bəzi araşdırmaçılar 2030-cu ilə qədər mümkün azalmanın təxminən 20 milyona çatacağı qənaətinə gəliblər (Allahverdiyeva).

Xidmətin rəqəmsal transformasiyası, şübhəsiz ki, turizm xidmətlərinin səviyyəsinə və keyfiyyətinə təsir göstərəcək. Rəqəmsallaşma, bir tərəfdən, hibrid turizm məhsullarının təqdim edilməsi imkanlarını genişləndirəcək, turistin şəxsiyyətinin fərdi xüsusiyyətlərini və onun üstünlüklərini nəzərə almağa imkan verəcək. Böyük məlumat sistemindən istifadə etməklə onlayn rejimdə toplanacaq,işlənəcək və sonradan fərdi təşviq üçün istifadə ediləcək.

Rəqəmsallaşma turizm agentliyi işçilərinin əmək xərclərini əhəmiyyətli dərəcədə azaldacaq. Bununla da onların xidmətləri gecə-gündüz əlçatan etmək deyil, həm də gələcəkdə yığılmış məlumatların rəqəmsal massivindən istifadə etməli olacaq turizm agentliyi işçilərinin səlahiyyətlərinə

olan tələbləri artıracaqdır. Rəqəmsallaşma fərdi müştəri məsləhəti üçün, təkcə işçiləri intuisiyasına, təcrübəsinə etibar etmir. Bu onu deməyə əsas verir ki, potensial otel müştəriləri vaxtlarını administratorla ünsiyyətə sərf etməyə hazır deyillər. Bu isə o deməkdir ki, bu mütəxəssislərə də tezliklə ehtiyac olmayacaq.

Turizm sahəsində rəqəmsal xidmətlərin inkişafı həm ev təsərrüfatlarına, həm dövlət orqanlarına, həm də turizm sənayesindəki firmalara xidmət göstərən bütün istehlakçıları əhatə edən mürəkkəb prosesdir. Turizm sahəsində bir müəssisə öz fəaliyyətinin rəqəmsal inkişafı üçün lazımi şəraitə malik olmalıdır. Turizmdə rəqəmsal xidmətlərin inkişafına təsir edən amilləri müəyyən etmək önəmlidir (Formation of competitive tourism in Azerbaijan Institute of Economics of ANAS, 2017: 158).

Turizmin inkişaf səviyyəsi ölkənin, onun regionlarının sosial-iqtisadi inkişafını və əhalinin rifahını xarakterizə edən parametrlərdən biridir. Turizm sənayesində innovasiyalar mühüm rol oynayır. Dünya təcrübəsi göstərir ki, turizm gəlirliliyinə və inkişaf dinamikasına görə neft-qazın hasilatı və emalından sonra ikinci yerdədir. Turizm bir çox dövlətlərin milli iqtisadiyyatları üçün iqtisadi fəaliyyətin ən vacib sahəsidir.

Bundan əlavə, qeyd etmək lazımdır ki, turizm informasiya ilə zəngin bir sahədir və burada məlumatların toplanması, ötürülməsi, təhlili və saxlanması sənayenin bütün səviyyələrində qərarların qəbul edilməsində mühüm rol oynayır. Bununla əlaqədar olaraq, rəqəmsal xidmətlərin formalaşması və inkişafı turizm fəaliyyəti üçün böyük əhəmiyyət kəsb edir. Burada ən son informasiya-kommunikasiya texnologiyaları artıq fəal şəkildə istifadə olunur. Turizmin informasiya təminatı turizm sisteminin səmərəli fəaliyyətini təmin edən, onun emalı və təhlili üçün nəzərdə tutulmuş, ixtisaslaşmış informasiya texnologiyaları haqqında kompleks məlumat bazasıdır. Rəqəmsal xidmət, rəqəmsal məlumat və əlaqəli məlumatların idarə edilməsi metodlarının əsas olduğu unikal iqtisadiyyat növüdür. Rəqəmsal xidmətlər rəqəmsal istehsalın bütün digər elementləri üzərində dominant rolu ilə xarakterizə olunur. Turizm fəaliyyətində xidmətlərin istehsalında nəticə xidmətin potensial istehlakçısının ala biləcəyi məlumatdır. Turizm fəaliyyətinin son nəticəsi isə istehlakçının səyahət zamanı aldığı təəssüratdır (Əlirzayev, 2010: 529).

## Nəticə

Rəqəmsal xidmətlər bütün səviyyələrdə iqtisadi sistemlərdə baş verən biznes proseslərinin inteqrasiyasına əsaslanır. İnformasiya komponentinə xüsusi əhəmiyyət verilməlidir. Vahid informasiya məkanının formalaşdırılması əhalinin sosial-iqtisadi sahəyə yönəlmiş yüksək keyfiyyətli informasiyaya ehtiyacı nəzərə alınmaqla həyata keçirilməlidir. Rəqəmsal xidmətlərin əsas fərqləndirici amili ondan ibarətdir ki, informasiyanın dəyəri daim artırılmalıdır.

Turizm sektorunda vahid informasiya məkanının formalaşdırılması məsələsi uzun müddətdir ki, müzakirə olunur. Turizm sənayesi bütün diqqətini ən son rəqəmsal texnologiyaların fəal tətbiqinə yönəldilməlidir. Artıq fəaliyyətlərin əksəriyyəti rəqəmsal xidmətin inkişafına uyğun olaraq yenidən qurulmalıdır, o cümlədən turların sifarişi sistemi, elektron ödəniş texnologiyaları və s. Rəqəmsal xidmətin formalaşma səviyyəsi daha çox informasiya-kommunikasiya texnologiyalarının (İKT) inkişafı və onların cəmiyyətin sosial-iqtisadi həyatında tətbiqi dərəcəsi ilə müəyyən edilir (Luzgina, 2020: 100-105).

Ən çox internet texnologiyaları maliyyə əməliyyatlarında, dövlət orqanları ilə qarşılıqlı əlaqədə və istehlakçılarla ünsiyyətdə istifadə olunur. Əsasən turizm sektorundakı bütün müəssisələr müəyyən dərəcədə informasiya-kommunikasiya texnologiyalarından istifadə edilməlidir.

## Ədəbiyyat

1. Bilalov, B. (2006). "Turizm Fəaliyyətinin Tənzimlənməsi". Bakı. Mütərcim nəşriyyatı. 278 s.
2. Bilalov, B., Gülalıyev, Ç. (2015). "Turizmin Əsasları". Bakı. 492 s.
3. Əliyev, A. (2004). "Azərbaycan sənayesində xarici və daxili investisiyalardan səmərəli istifadə". Bakı. 26 s.
4. Azerbaijan (guide). (2003). Baku.
5. Azar, V. (1973). Transport and tourism. Moscow.

6. Kirillova, S. (2015). Trends and development potential of the global and regional markets for tourism services. Innovative technologies for managing the socio-economic development of Russian regions. Materials of the VII All-Russian scientific-practical conference with international participation in 2 parts, p.89-98.
7. Golovenchik, G. (2018). Transformation of the labor market in the digital economy. Digital transformation. №4 (5), p.27-43.
8. Əlirzayev, Ə. (2005). İslahatlar və sürətləndirmə strategiyası şəraitində Azərbaycanın sosial-iqtisadi problemləri. Bakı, 537 s.
9. Əlirzayev, Ə. (2006). Azərbaycan dövlətçiliyinin qanunvericilik bazasının təkmilləşdirilməsi üzrə təcrübə və perspektiv düşüncələr. Bakı. 512 s.
10. Allahverdiyeva, L., Ph.D. in economics. (2017). Formation of competitive tourism in Azerbaijan Institute of Economics of ANAS. Baku. 158 p.
11. Əlirzayev, Ə. (2010). “Turizmin iqtisadiyyatı və idarə edilməsi”. 529 s.
12. Luzgina, S. (2020). Digital transformation of the national economy: challenges and development prospects. Bank's Bulletin. №3, s.100-105.

Göndərildi: 26.06.2022 Qəbul edildi: 01.09.2022

# İÇİNDƏKİLƏR

**Səidə Cəfər qızı İsmayılzadə**
Avropanı qaranlıq çağlardan İntibah dövrünə çıxaran Əndəlüs mədəniyyətinə dair ...........................5
**Vasif Balakhan Haziyev**
Sustainable development of the national food market in Azerbaijan ..................................................9
**İlkanə Rabil qızı Əmirova**
Qədim ingilis dilində “meşə” sözünün işlənmə yeri və formaları ................................................. 13
**Nurlan Ramiz oğlu Məmmədov**
Azərbaycanda əlavə təhsilin təşkilinin əsas istiqamətləri və təşkili modellərinə dair........................... 18
**Günay Loğman qızı Ağayeva**
Texniki universitetlərin hazırlıq fakültələrində ingilis dilində nitq bacarıqlarının formalaşdırılmasının linqvistik əsasları ......................................................................................... 26
**Araz Fazil oğlu Qasımov**
Turizmin inkişafında rəqəmsal xidmətlər..........................................................................................33

---

İmzalandı: 26.09.2022
Formatı: 60/84, 1/8
H/n həcmi: 4,25 ç.v.
Sifariş: 564

https://aem.az saytında çap olunub.
**Ünvan:** Bakı şəh., Mətbuat prospekti, 529-cu məh.,
“Azərbaycan” nəşriyyatı, 6-cı mərtəbə.
Tel.: +994 50 209 59 68
+994 55 209 59 68
+994 12 510 63 99
e-mail: info@aem.az